QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

Yanvar
2013
1 (1045)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin 90 illik yubileyi haqqında

## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Dahi Heydər Əliyev şəxsiyyətinin Azərbaycan dövlətçilik tarixində müstəsna yeri vardır. Azərbaycançılıq məfkurəsinin parlaq daşıyıcısı kimi Heydər Əliyev öz müdrik siyasəti, dönməz əqidəsi və tarixi uzaqgörənliyi sayəsində milli dövlətçilik ideyasının gerçəkləşdirilməsinə, müasir Azərbaycan dövlətinin qurulmasına və xalqımızın müstəqillik arzusuna çatmasına nail olmuşdur. Məhz Heydər Əliyevin fəaliyyəti nəticəsində Azərbaycan özünün geostrateji, iqtisadi və mədəni potensialından istifadə edərək Şərqlə Qərb arasında etibarlı körpü rolunu oynamağa başlamış və dünyanın ən dinamik inkişaf edən ölkələrindən birinə çevrilmişdir.

Azərbaycanda müasir demokratik, hüquqi və dünyəvi dövlət quruculuğu, vətəndaş cəmiyyətinin təşəkkülü, milli-mənəvi dəyərlərə qayıdış və elmin, təhsilin, mədəniyyətin inkişafı əbədi surətdə Heydər Əliyevin adı ilə bağlıdır. Ölkəmizin əsas qanunu Konstitusiyanın qəbul edilməsi, hakimiyyətlərin bölünmə prinsipinin təsbit olunması, hüquq normalarının və qanunvericilik bazasının beynəlxalq standartlara uyğunlaşdırılması, müasir idarəetmə üsullarının bərqərar olması və müvafiq dövlət qurumlarının formalaşdırılması Heydər Əliyevin rəhbərliyi ilə gerçəkləşən genişmiqyaslı quruculuq proqramının tərkib hissələridir.

Azərbaycanın dünya miqyasında neft-qaz hasil və ixrac edən ölkəyə çevrilməsi, milli neft strategiyasının uğurla həyata keçirilməsi, xarici dövlətlərin aparıcı neft şirkətləri ilə müqavilələrin bağlanması, neft sənayesinin müasir tələblərə uyğun infrastrukturunun qurulması, neftin Bakı-Tbilisi-Ceyhan, Bakı-Supsa, Bakı-Novorossiysk boru kəmərləri vasitəsilə şaxələnmiş şəkildə nəqli bilavasitə Heydər Əliyevin xidmətləridir.

Dünya iqtisadiyyatına uğurla inteqrasiya, ölkə daxilində iqtisadi liberallaşma, kredit reytinqimizin artması, iqtisadiyyatımızın rəqabət qabiliyyətliliyinin yüksək mövqedə olması, büdcəmizin və valyuta ehtiyatlarımızın ildən-ilə çoxalması 1993-cü ildən etibarən Heydər Əliyev tərəfindən yeni prinsiplər əsasında qurulan iqtisadiyyatın sabitliyinin bariz nümunəsidir. Azərbaycanda qeyri-neft sektorunun uğurla inkişaf etdirilməsi də Heydər Əliyevin uzaqgörənliyinin məntiqi nəticəsidir.

Postsovet məkanında analoqu olmayan cəsarətli qərarları ilə Heydər Əliyev torpağın şəxsi mülkiyyətə verilməsi ilə ölkəmizin ərzaq təhlükəsizliyini təmin etmiş oldu. Bu gün müxtəlif kənd təsərrüfatı komplekslərinin uğurlu fəaliyyəti onun aqrar siyasətinin parlaq təzahürüdür.

Ulu öndərin vaxtilə Cəmşid Naxçıvanski adına hərbi liseyin açılması ilə həyata keçirməyə başladığı müdrik siyasəti milli ordumuzun formalaşması və Azərbaycan Silahlı Qüvvələrinin yaradılması mərhələlərindən keçərək onun Cənubi Qafqazda aparıcı hərbi qüvvə olmasına gətirib çıxarmışdır.

Ana dilimizin dövlət dili kimi tətbiqində, onun imkanlarının genişləndirilməsi və Azərbaycan xalqının ən böyük sərvəti kimi dəyərləndirilməsində Heydər Əliyev şəxsiyyətinin rolu danılmazdır. Azərbaycan mədəniyyətinin və zəngin tarixi irsimizin dünya ictimaiyyətinə tanıdılması Heydər Əliyevin misilsiz xidmətlərindəndir. Məhəmməd Füzulinin 500 illik və "Kitabi-Dədə Qorqud"un 1300 illik yubileylərinin UNESCO səviyyəsində keçirilməsi Azərbaycan mədəniyyətinin təbliğinə xidmət edərək beynəlxalq mədəni ictimaiyyətlə yeni əməkdaşlıq formalarının bərqərar olmasına gətirib çıxarmışdır.

Heydər Əliyevin rəhbərliyi altında milli maraqlara əsaslanan və siyasi perspektivləri nəzərə alan xarici siyasət kursu müəyyənləşmiş, dünyanın aparıcı dövlətləri və beynəlxalq təşkilatları ilə qarşılıqlı münasibətlər qurulmuşdur. Onun uğurlu xarici siyasəti ölkəmizin etibarlı tərəfdaş kimi qəbul edilərək beynəlxalq miqyasda nüfuzunun artmasına, islahatçı və təşəbbüskar dövlət olaraq tanınmasına xidmət göstərmişdir. Heydər Əliyevin beynəlxalq aləmdə atdığı qətiyyətli addımlar sayəsində diplomatiyamızın fəal mövqeyi formalaşmış, Azərbaycanın zorla cəlb olunduğu Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinə dünya ictimaiyyətinin münasibəti dəyişmiş, ölkəmizin suverenliyi, ərazi bütövlüyü və sərhədlərinin toxunulmazlığı bütün beynəlxalq hüquqi-normativ sənədlərdə öz əksini tapmışdır.

Heydər Əliyev Böyük İpək Yolunun mühüm mərkəzi olan, mədəniyyətlərin və sivilizasiyaların qovşağında yerləşən ölkəmizi dünyada tolerantlığın və dözümlülüyün məkanı kimi tanıtmışdır. Onun beynəlxalq səfərləri, siyasi, ictimai və dini xadimlərlə görüşləri ölkəmizin yeni imicinin formalaşmasına xidmət edirdi.

Xalqımızın ümummilli liderinin "Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən azərbaycanlıyam" sözləri dünya azərbaycanlılarının şüarı olmaqla soydaşlarımızın həmrəyliyinin təməl daşına çevrilmişdir. Müstəqil Azərbaycan Respublikasına rəhbərlik etdiyi illər ərzində Heydər Əliyev tərəfindən aparılan ardıcıl və məqsədyönlü siyasət nəticəsində Azərbaycan diasporu təşkilatlanmış, inkişaf etmiş və öz tarixi vətəni ilə sıx bağlılığını nümayiş etdirmişdir. Bu gün dünyanın müxtəlif guşələrində yaşayan azərbaycanlıların müstəqil Azərbaycan Respublikasını öz vətəni sayması, onu milli ruhun, milli-mənəvi dəyərlərin, milli mədəniyyətin məbədi kimi qəbul etməsi və azərbaycançılıq ideyası ətrafında birləşməsi məhz Heydər Əliyev fəaliyyətinin nəticəsidir.

Heydər Əliyevin XX əsrdə totalitarizmin Azərbaycana qarşı törətdiyi faciələrin davamı kimi qanlı 20 Yanvarı xalqımız əleyhinə hərbi, siyasi və mənəvi təcavüz kimi qiymətləndirməsi onun ömrü boyu sadiq qaldığı siyasi məfkurəsinin və yüksək vətənpərvərliyinin yeni siyasi şəraitdə təcəssümü idi. Mövcud siyasi, iqtisadi və sosial böhran müstəqilliyimizin ilk illərində Azərbaycanı vətəndaş müharibəsi həddinə çatdırdığı bir dövrdə Heydər Əliyevin xalqın təkidli tələbi ilə hakimiyyətə gəldiyi gün - 1993-cü ilin 15 iyunu tariximizə Qurtuluş Günü kimi daxil olmuşdur. Bu qurtuluş qısa bir zamanda özünü nəinki siyasətdə, həm də iqtisadiyyatda, təhsildə, mədəniyyətdə və insanların gündəlik real həyatında büruzə vermişdir.

Tənəzzülə uğrayan iqtisadiyyat, sürətlə artan inflyasiya, işsizlik, ümidsizlik mühiti və digər neqativ hallarla üz-üzə qalmış Azərbaycanı Heydər Əliyev qısa bir zamanda iqtisadi və mədəni yüksəliş yolu tutan, xarici sərmayələrə açıq olan və böyük beynəlxalq layihələrə qoşulan ölkəyə çevirə bildi. Heydər Əliyevin qurduğu dövlətin iqtisadi siyasəti əhalinin sosial müdafiəsini daim diqqət mərkəzində saxlamaqla sosial yönümü ilə səciyyələnirdi. Bu gün Azərbaycan nüfuzlu vətəndaş cəmiyyətinin əsaslarının qurulduğu, müxtəlif siyasi partiyaların sərbəst fəaliyyət göstərdiyi, yüzlərlə senzurasız qəzet və jurnalın nəşr olunduğu, eləcə də çox sayda özəl telekanalların yayımlandığı və internet şəbəkəsi istifadəçilərinin sayının sürətlə artdığı bir ölkədir.

Heydər Əliyev öz siyasi dühası ilə Azərbaycanın müasir simasını müəyyənləşdirmiş və xalqımızın taleyində silinməz izlər qoymuşdur. Onun siyasəti nəticəsində əldə olunan misilsiz nailiyyətlər göz qabağındadır. Bu uğurlar paytaxtımızın daim yeniləşən görkəmində, şəhər və rayonlarımızın sürətlə modernləşməsində, iqtisadiyyat və elmdə, təhsil, mədəniyyət və səhiyyədə, eləcə də ictimai-siyasi həyatımızda öz əksini tapmışdır.

Heydər Əliyevin memarı olduğu Azərbaycan bu gün böyük tikinti meydançasını xatırladır. Yüzlərlə sənaye və infrastruktur obyektləri, məktəblər, xəstəxanalar, idman qurğuları, yaşayış evləri, inzibati binalar və digər tikililər ucaldılır, yollar salınır. "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası bizim gələcək planlarımızı əks etdirməklə yanaşı, bir daha sübuta yetirir ki, Heydər Əliyevin ölkəmizin sürəkli tərəqqisini bu gün də təmin edən irimiqyaslı proqramları xalqımızın sosial-iqtisadi vəziyyətinin daim yaxşılaşmasına xidmət göstərir.

Müstəqil Azərbaycan dövlətinin hərtərəfli inkişafı yolunda əvəzsiz tarixi xidmətlərini nəzərə alaraq, milli dövlətçilik ideyasının bərqərar olması və ölkəmizin beynəlxalq aləmdə nüfuzunun artması naminə misilsiz töhfələr vermiş Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin 90 illik yubileyinin ölkə miqyasında layiqincə keçirilməsini təmin etmək məqsədilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin 90 illik yubileyi Azərbaycan Respublikasında dövlət səviyyəsində geniş qeyd edilsin.

2. Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin 90 illik yubileyinin keçirilməsinə dair Tədbirlər Planı təsdiq edilsin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 21 yanvar 2013-cü il*

# İMTAHANLAR OBYEKTİVLİK VƏ ŞƏFFAFLIQ ŞƏRAİTİNDƏ KEÇİRİLİR

***Yeri gəlmişkən:*** *Yanvarayının 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2012-2013-cü tədris ilinin payız imtahan semestrinin imtahan sessiyasının gedişi ilə bağlı respublikamızın kütləvi informasiya vasitələrinin nümayəndələri (KİV) üçün mətbuat konfransı keçirilib. Mətbuat konfransında ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov vəTədris-metodika şöbəsinin müdiri, dosent Namiq Hacıyev bu ali təhsil müəssisəsində imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil olunması, həmçinin tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin edilməsi üçün həyata keçirilən əməli tədbirlər barədə KİV nümayəndələrinə ətraflı və dolğun məlumat vermişlər.*

***

*Yanvarın 18-də Təhsil Nazirliyinin Korrupsiyaya qarşı Mübarizə üzrə İşçi Qrupunun üzvlərindən Korrupsiyaya qarşı Mübarizə Fondunun icraçı direktoru Vasif Mövsümov və fondun hüquqşünası Nəzirməmməd Kazımov universitetdə olaraq monitorinq keçirmiş, imtahanların gedişini yüksək qiymətləndirmişlər.*

Bilik - gizlədilməsi mümkün olmayan incidir, sərvətdir. Etiraf etməliyik ki, son illər ölkəmizdə ali təhsilin keyfiyyətinin yüksəldilməsi istiqamətində ADPU-da həyata keçirilən islahatlar diqqəti xüsusi cəlb edir. Bunu da xüsusi qeyd etməliyik ki, imtahanların informasiya-kommunikasiya texnologiyalarının (İKT) vasitəsi ilə keçirilməsi ilk dəfə 2006-2007-ci tədris ilində ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədovun təşəbbüsü ilə tətbiq olunmuş, sonra respublikanın digər universitetləri arasında yayılmışdır. İldən-ilə bu layihənin əhatə dairəsi genişləndirilmiş və hazırda əyani şöbənin bütün kurslarında, eləcə də qiyabi şöbənin isə I-III kurslarında tətbiq edilir. Eyni zamanda ADPU-da dövlət imtahanları da İKT vasitəsi ilə keçirilir. Yalnız qiyabi şöbənin IV və V kurslarında təhsil alan tələbələr yazılı imtahan verirlər.

ADPU-da payız imtahan sessiyası necə yekunlaşıb? Azərbaycan mühiti üçün yenilik olan bu layihə necə həyata keçirilir, universitetin tələbələri tərəfindən necə qarşılanır?

Cavab imtahanların davam etdiyi dövrdə hazırladığımız yazıda.

* * *



**Oqtay Sultanov, Tarix fakültəsinin dekanı, professor:** "Təhsil hər bir xalqın, dövlətin ən vacib, ən strateji sahəsi, inkişafının prioritet istiqamətidir. Eyni zamanda təhsil hər bir cəmiyyətin inkişaf səviyyəsini və dövlətin qüdrətini müəyyən edən başlıca amildir. Elm və insan kapitalı məhz təhsildə formalaşır, müasir informasiya texnologiyaları isə elmə əsaslanır. Böyük razılıq və qürur hissi ilə deyə bilərik ki, «Təhsil millətin gələcəyidir!» deyən ulu öndərimiz Heydər Əliyevin müdrik dövlətçilik kursunu çox uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin elm və təhsili müstəqil ölkəmizin davamlı inkişaf strategiyasının əsas amili hesab etməsi və insan kapitalının formalaşmasına yüksək qiymət verməsi hazırda respublikamızda bu sahələrin hərtərəfli tərəqqi və inkişafında mühüm rol oynayır.

Hər bir tələbənin bilik səviyyəsini üzə çıxaran imtahanlardır. Tələbələrimiz həmişə olduğu kimi, bu bilik yarışmasına da ciddi hazırlaşıblar. İmtahanqabağı müəllimlərimizin tələbələrlə tez-tez imtahanlarla bağlı sınaq söhbətləri olub. Çətin dərk olunan mövzular tələbəyə izah edilib, aydınlaşdırılıb. Axı imtahan - tələbənin biliyinin göstəricisi olduğu kimi, tələbənin də bilik səviyyəsi-müəllimin müəllimlik bacarığının, səriştəsinin göstəricisidir. Bundan başqa, meyvə bağbanın əməyinin nəticəsidirsə, sabahın görkəmli, savadlı, bəlkə də dünya şöhrətli ziyalısı olmaq kimi göstəricilərə malik ola biləcək tələbə də müəllimin əməyinin nəticəsidir. Fakültəmizin müəllimləri bu meyarı əsas götürərək tələbələrə qayğı ilə yanaşırlar. İmtahanqabağı isə bu diqqət, qayğı birə-beş artır.

Sessiya başa çatmaq üzrədir. Əldə olnunan nəticələr qənaətbəxşdir. İmtahanlarda iştirak edən 557 tələbədən 101 nəfəri yazılı imtahana girməklə bilik səviyyələrini bir də sınamışlar. Bu mübarizə meydanında bəzi tələbələrimiz "əla", bəzi tələbələrimiz isə biliklərinin "yaxşı" qiymətləndirilməsinə nail olmuşlar.

İmtahanların davam etdiyi müddətdə fakültə münaqişə komissiyası fəaliyyət göstərir. Komissiyaya fakültəmizin təcrübəli pedaqoqları cəlb olunmuşlar. İmtahan qiymətindən narazı qalan tələbə fakültə apelyasiya komissiyasına müraciət edir. Həmin tələbə fakültə apelyasiya komissiyasına dəvət olunur, cavablara komissiya üzvlərinin iştirakı ilə təkrar baxılır və təkrar qiymətləndirilmə aparılır.

Tələbə etdiyi müraciətin nəticəsindən narazı qalarsa, universitet apelyasiya komissiyasına müraciət edə bilər. Bu, onun hüququdur. Bu payız semestrinin nəticələrindən narazı qalan 19 tələbə fakültə apelyasiya komissiyasına müraciət etmişdi. Müraciətlərin hamısı apelyasiya münaqişə komissiyalarında həllini tapmışdır.

Bütövlükdə götürdükdə, fakültəmizdə payız imtahan sessiyası normal mənəvi-psixoloji mühitdə, şəffaf və obyektiv keçirilir".

* * *



**Buludxan Xəlilov, Filologiya fakültəsinin dekanı, professor:** "Etiraf edim ki, əvvəlki illərdə test sualları arasında qüsurlu suallara da təsadüf edilirdi. Bu isə həm kollokviumlarda, həm də imtahan prosesində tələbələrdə narahatlıq yaradırdı. Belə ki, nəticədən narazı qalan tələbə fakültə apelyasiya komissiyasına, problem burda həllini tapmayanda isə universitet apelyasiya komissiyasına müraciət etməyə məcbur olurdu ki, bu da nəticə etibarilə tələbənin vaxtını alır, digər imtahanlara lazımi səviyyədə hazırlaşmasına mane olurdu. İndi bunabənzər hallar aradan qalxıb, yaxud yox dərəcəsindədir.

Başlıcası isə budur ki, indi hərə öz işi ilə məşğuldur. Tələbə bilir ki, yalnız oxumaqla, bilik əldə etməklə, öz bilik səviyyəsini nümayiş etdirməklə müvafiq bal toplamaq imkanındadır. Bütün bunlar göstərir ki, təhsildə aparılan davamlı islahatlar ADPU-da da öz bəhrəsini verir. Yəni ADPU müəllim kadrları yetişdirən ali təhsil müəssisələrinin flaqmanı olmaqla öz dəst-xəttini, öz yolunu çox uğurla aparır. Bu dəst-xətti, bu yolu Filologiya fakültəsinin də simasında görürük.

İndi test üsulu ilə imtahanların aparılmasının elə bir mərhələsidir ki, keyfiyyətə xüsusi diqqət yetirmək lazımdır. Ona görə də kompyuterdə imtahan verdikdən sonra "yaxşı", "yaxşı-əla" və "əla" qiymət almış tələbələrin biliyinin düz olan həddini yazılı imtahan tamamlayır. Yazılı imtahan əzbərçiliyin, yalnız faktları bilməyin qarşısının alınmasında olduqca önəmli vasitədir. Çünki yazılı imtahanda tələbənin düşünmək, dəqiq və düzgün yazmaq, məsələləri təhlil edib araşdırmaq və s. kimi imkanları da üzə çıxır.

Onu da qeyd edim ki, əyani şöbənin Azərbaycan dili və ədəbiyyatı, eləcə də ingilis dili və fransız diliixtisaslarında istisnalıq təşkil edən imtahanlar var ki, bu imtahanlar da yazılı aparılır. Bu işdə də narahatçılıq müşahidə olunmayıb. Yazılı imtahanlar da koordinatorların nəzarəti altında uğurla aparılır.

Dekanlığın qapısı bütün tələbələrin üzünə açıqdır. Bir tələbənin müraciət etdiyini özünüz də gördünüz. Ona çox qayğı və diqqətlə yanaşdım, mülahizələrini dinlədim. Müəllimi də söhbətə dəvət etdim və münaqişə tələbənin xeyrinə həll olundu. Ona görə ki, həqiqət tələbənin tərəfində idi".

* * *



**Maqsud Nəcəfov, Riyaziyyat fakültəsinin dekanı, dosent:** "ADPU-da imtahanların informasiya-kommunikasiya texnologiyaları (İKT) vasitəsi ilə keçirilməsiuniversitetimizin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun bu ali təhsil müəssisəsində apardığı uğurlu təhsil islahatının istiqamətlərindən biridir. Bu layihənin tətbiqi müəllimlərinin də, tələbənin də məsuliyyətini artırıb. Belə olanda tələbə də, müəllim də, bir sözlə, hamı öz hüquq və vəzifəsini bilir, tələbə-müəllim münasibətləri öz axarında olur.

ADPU-nun bu gün ölkənin sayılıb-seçilən universitetlərindən biri olması məhz Yusif müəllimin bu ali təhsil müəssisəsində apardığı təhsil islahatlarının uğurlu nəticəsidir.

Payız imtahan sessiyasına fakültənin bakalavr pilləsindən 1124 (792 nəfər əyani, 332 nəfər qiyabi şöbədə), magistratura pilləsindən isə 127, ümumilikdə 1251 tələbəmiz imtahanlara qatılıb.Hazırda fakültədə 3 ixtisas-riyaziyyat, riyaziyyat-informatika, informatika üzrə müəllim kadrları hazırlanır. Həmişə olduğu kimi fakültədə bu gün də kadr hazırlığına ciddi diqqət yetirilir. Tədrisin təşkili işi günün tələbləri səviyyəsində qurulub. İmtahanlar bütövlükdə təlimata uyğun təşkil edilib. Belə ki, imtahan cədvəlləri rektorun müvafiq əmrinə uyğun olaraq vaxtında tərtib olunub Tədris-metodika şöbəsinə təhvil verilmiş və təsdiq edilmişdir. Həm əyani, həm də qiyabi şöbələrdə imtahanlar uğurla davam etdirilir.

Tələbələrin imtahanlara hazırlıq səviyyəsini yüksəltmək məqsədilə fakültədə əlavə məşğələ saatları təşkil edilib. Müəllimlər müraciət edən tələbələrə mövzunu izah etmiş, lazımi məsləhətlərini vermişlər.

Fakültədə əyani şöbənin bütün kurslarında, qiyabi şöbədə isə I-III kurslarda imtahanlar İKT vasitəsi ilə aparılıb. Tələbələr yaxşı bilirlər ki, Təhsil Nazirliyinin təsdiq etdiyi Əsasnaməyə əsasən imtahanlar 100 ballıq sistemlə qiymətləndirilir: tələbə 50 balı semestr ərzindəki fəaliyyətinə görə, 50 balı isə imtahanın nəticəsinə görə toplaya bilər. 71 bal toplayan və "yaxşı", yaxud "əla" qiymət almaq istəyən tələbə II mərhələdə iştirak etməklə məqsədinə nail ola bilər.Nəticələr qənaətbəxşdir. II kurslardan riyaziyyat ixtisasında təhsil alan Bağırova Rəfiqə Adil qızı, Hacıyeva Samirə Bilal qızı, Məmmədova Pərvanə Həsənağa qızı, Əliyeva Əsmət Elşən qızı, Quluzadə Süracəddin Mübariz oğlu və Şəmiyeva Rufanə Nadir qızının, informatika ixtisasında oxuyan Əşrəfzadə Ulduz Namiq qızı ilə riyaziyyat-informatika ixtisasına yiyələnən Məmmədova Hürü Şamil qızının yazılı imtahanlarda da nəticələri ürəkaçandır. III kurs tələbələrindən Əlizadə Aygül Namiq qızı, Süleymanova Fəridə Sadıq qızı, Quliyeva Leyla Yunis qızı, Bayramlı Jalə Elşən qızı və Həsənova Vəfa İlham qızı, sonuncu kurs tələbələrindən isə Əsgərova Asya Rəsul qızı, Xankişiyeva Yəmən Yunis qızı, İdrisova Qönçə Arif qızı və Cabbarova Sevinc Hüseyn qızı da bu sınaqdan alnıaçıq, üzüağ çıxıblar.

* * *

Riyaziyyar-bütün elmlərin açarıdır. Özünü Azərbaycan dövlətinin vətəndaşı bilən, dövlət quruculuğu işində nümunə olmaq istəyən, xüsisilə bu sahədə təhsil alan hər kəs riyaziyyatın sirlərinə daha dərindən yiyələnməlidir".

* * *

(Davamı 3-cü səhifədə)

# İMTAHANLAR OBYEKTİVLİK VƏ ŞƏFFAFLIQ ŞƏRAİTİNDƏ KEÇİRİLİR

(Əvvəli 2-ci səhifədə)

Dekabr ayının 30-dan start götürmüş payız imtahan sessiyası fevral ayının 2-də yekunlaşıb. Sessiyanın davam etdiyi günlərdə biz də imtahanların gedişi ilə maraqlandıq. Kompyuter Mərkəzində İmtahanlara nəzarət qrupunun rəhbəri, dosent Qulaməli Balaşovla söhbətdən məlum oldu ki, hazırda universitetdə bakalavr pilləsinin əyani şöbəsində 24 ixtisas üzrə 10 fakültədə 5677, qiyabi şöbədə isə 8 fakültədə 9 ixtisas üzrə 2181, magistratura pilləsində isə bu göstərici 875 nəfəri təşkil edir. Əcnəbi tələbələrin işi üzrə fakültədə təhsil alan 100 xarici tələbəni və Əlavə təhsil fakültəsində 4 yeni ixtisasa yiyələnən daha 200 nəfəri də bu sıraya daxil etsək, ADPU-da təhsil alanların və deməli, payız imtahan sessiyasına qatılanların ümumi sayının 8933 olduğunu görərik. Obyektivliyin və şəffaflığın təmin olunması məqsədi ilə hər imtahan fənni üzrə işlənmiş proqramı əhatə edən 700 testdən ibarət mükəmməl imtahan test bankı yaradılıb. Aydınlıq məqsədi ilə oxucuya məlumat verməyi vacib bilirik ki, kredit sisteminə görə fənlər üç qrupa bölünür: ardıcıl və məcburi fənlər; məcburi, ancaq ardıcıl olmayan fənlər və seçmə fənlər.

İmtahanlar iki növbədə, 180 kompyuter vasitəsi ilə 5 zalda aparılır. Hər növbədə 4 dəfə imtahan keçirilir. Bir saat ərzində təqribən 170-180 nəfər tələbə imtahan vermək imkanındadır. Bu isə gün ərzində 1350-1400 tələbənin imtahan prosesinə cəlb olunması deməkdir. 100 ballıq qiymətləndirmə sisteminə görə, 50 bal tələbənin semestr ərzindəki fəaliyyətinə, 50 bal isə imtahanın nəticəsinə görə verilir. Tələbəyə 5 cavab variantından ibarət 25 sual təqdim olunur. Düzgün cavablandırılan hər sual 2 balla qiymətləndirilir. Beləliklə, tələbənin imtahanqabağı topladığı balla imtahanın nəticəsi cəmlənərək yekun qiymət müəyyənləşdirilir.

Ötən tədris ilinin yaz imtahan sessiyasından imtahanların gedişinə daha bir yenilik əlavə olunub: universitet Elmi Şurasının qərarına əsasən imtahanlar 2 mərhələdə keçirilir. 60 bal toplamaq beşballı sistemlə "kafi" qiymət kimi dəyərləndirilir. Daha yüksək qiymət almaq uğrunda mübarizəyə 71 bal toplayan tələbələr könüllülük prinsipi əsasında qatıla bilərlər. Bunun üçün imtahanın I mərhələsini başa çatdırandan sonra dərhal kompyuterin müvafiq düyməsini basmaqla II mərhələyə keçmək, başqa sözlə, yazılı imtahana buraxılmaq hüququ əldə etməlidir. Bu yeniliyin tətbiqində məqsəd tələbələri əzbərçiliyə meyillikdən uzaqlaşdırmaqla onları imtahanlara daha məsuliyyətli hazırlaşmağa sövq etmək və fikirlərini yazılı şəkildə ifadə etmək bacarığı aşılamaqdır.

Koordinator-nəzarətçilər bir qayda olaraq qeyri-ixtisas müəllimləri arasından seçilir ki, bu da tələbəyə imtahan zamanı kömək göstərmək kimi mənfi hallara yol verilməsinin qarşısını almaq məqsədini daşıyır. İKT ilə götürülən imtahanın nəticəsi elə həmin andaca tələbəyə məlum olur. Tələbə əgər yazılı imtahan veribsə, yazılar koordinator otağında şifrələndikdən sonra qiymətləndirilmək üçün fənn müəlliminə verilir. Şifrələnmə o deməkdir ki, bu zaman müəllim kimin yazısını qiymətləndirdiyini bilmir. Nəticə isə tələbənin imtahan verdiyi gün elan edilir. Qiymətləndirmədən narazı qalan tələbə apelyasiya komissiyasına müraciət etmək hüququna malikdir. Apelyasiyada fənn müəllimlərinin iştirakı ilə tələbənin cavabı yenidən araşdırılır.

Dosent Q.Balaşov akademik borcu olan tələbələr üçün 6 həftəlik yay semestri təşkil edildiyindən də söz açdı və bu yeniliyin tələbənin xeyrinə olan üstünlüklərini diqqətə çatdırdı.

Onu da qeyd edək ki, Təhsil Naziri, professor Misir Mərdanovun məlum əmrinə müvafiq olaraq ADPU-nun rektoru, professor Yusif Məmmədovun 23 aprel 2012-ci il tarixli 3/92 saylı əmri ilə universitetdə fakültələr üzrə apelyasiya komissiyaları, 4 may 2012-ci il tarixli 3/105 saylı əmri ilə isə imtahanların gedişində yarana biləcək mənfi halların qarşısının alınması, yol verilən nöqsanların vaxtında aradan qaldırılması, eyni zamanda imtahanların gedişi ilə bağlı daxil olan ərizə, şikayət və təkliflərin çevik araşdırılması və tələbələrin müraciətlərinə vaxtında baxılması məqsədilə 9 nəfərdən ibarət "Qaynar xətt" qərargahı yaradılıb."Qaynar xətt" qərargahına ADPU-nun Azərbaycan tarixi kafedrasının müdiri, Əməkdar elm xadimi, Dövlət Mükafatı laureatı, professor Süleyman Məmmədov rəhbərlik edir. Qərargahın tərkibinə universitetin ən nüfuzlu professor-müəllimləri cəlb olunmuşlar. Bundan əlavə, bütün fakültələrdə apelyasiya komissiyaları yaradılıb. İmtahanların gedişinə nəzarəti daha da gücləndirmək məqsədi ilə bütün imtahan otaqlarında kameralar quraşdırılıb.

***

Ən obyektiv rəy - ictimai rəydir. Bu məqsədlə imtahanların gedişi ilə maraqlandıq, tələbələrlə həmsöhbət olduq.

Filologiya fakültəsinin IV kursunun 403-cü qrup tələbəsi Ruzigar Əlizadə "Azərbaycan dilinin üslubiyyatı" fənnindən imtahan verib. Ruzigarın imtahanqabağı balı 48 olub, test imtahanından isə 50 bal toplayıb. Əla qiymət almaq iddiasında olan Ruzigar II mərhələdə özünü sınamaq istəyindədir.

Pedaqogika və psixologiya fakültəsinin IV kursunun 405-ci qrup tələbəsi İlahə Qafarova, Kimya fakültəsinin III kursunun 305-ci qrup tələbəsi Afər Süleymanova, Filologiya fakültəsinin IV kursunun 402-ci qrup tələbəsi Arzu İbrahimova və Pedaqoji fakültənin IV kursunun 402-ci qrup tələbəsi Aytən Osmanova isə II mərhələdə imtahan vermək niyyətində deyillər.

Başqa bir imtahan otağında isə "yaxşı" və "əla" qiymət almaq üçün yazılı imtahanlarda iştirak edən tələbələrlə söhbət etdik. Aytən Tağıyeva, Vəfa Fərzəliyeva, Səbinə Hüseynova, Zəhra Məsimova, Xeyransa Mürsəlova artıq yazılı imtahanı başa çatdırmışdılar. 405-ci otaqda isə Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin IV kursunun qiyabi şöbəsində təhsil alan tələbələr imtahan verirdilər.



Həmin gün universitet mərkəzi kitabxanasının oxu zalında da xüsusi canlanma var idi. Burada magistrantlar imtahan verirdilər. Rübabə Qasımova, Aynur Süleymanova və Səbinə Osmanova artıq imtahanı başa çatdırmaq ərəfəsində idilər.

Tələbə və magistrantların imtahanların aparılması ilə bağlı münasibətləri ürəkaçandır. Onlar ADPU-da biliyin yeganə meyar olmasını təmin etdiyinə görə universitetin rektoru, professor Y.Məmmədova minnətdarlıqlarını bildirdilər. Magistrant R.Qasımova bizimlə söhbətində dedi ki, ADPU-da imtahanlar adətən öz şəffaflığı, obyektivliyi və ciddiliyi ilə seçilir. Bu gün də həmin prinsiplər gözlənildi. Həm də daha şəffaf, daha obyektiv, daha ciddi tərzdə. İmtahanlara belə ciddi nəzarətin olması ali təhsilin magistratura pilləsində xüsusilə təqdirəlayiqdir. Axı magistratura pilləsi gələcəkdə alim olmaq idiasında olan hər hansı gəncin bu yolda ilk sınağıdır, özünə inamının göstəricisidir. Buna görə bütün magistrantlar adından universitet rəhbərliyinə minnətdarlığını bildirirəm və qiymətləndirmənin də həmin meyara əsaslanacağına inanıram.

* * *

Apardığımız müşahidələrdən, tələbələrlə söhbətlərdən son olaraq bir daha bu qənaətə gəldik ki, ADPU-da həyata keçirilən hər hansı bir yenilik, hər hansı bir layihə yalnız imtahanların obyektiv və şəffaf keçirilməsinə xidmət edir. Məhz bunun nəticəsidir ki, sessiya zamanı ehtimal oluna biləcək hər hansı mənfi halın qarşısı vaxtında alınır. Sözün həqiqi mənasında biliyin yeganə meyar olduğuna əmin olan tələbələr imtahanlara daha ciddi və həvəslə hazırlaşırlar. Pedaqoji Universitetdə təhsil alan hər kəs bu gün yaxşı dərk edir ki, müəllim cəmiyyətdə yeri və mövqeyi həmişə görünən yeganə peşə sahibidir, cəmiyyət öz gələcəyini ona etibar edir, onun əməyi sayəsində cəmiyyət formalaşır, savadlı, geniş dünyagörüşlü, nümunəvi mənəvi-əxlaqi keyfiyyətlərə malik insan - vətəndaş formalaşır. İmtahanlarda əldə etdikləri göstəricilərlə ADPU-nun tələbələri bütün addımlarında müəllim adının yüksəkliyini, şərəfini qorumağa çalışırlar.

**Ayətxan İsgəndərov,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü**








## Dəyərli biblioqrafik vəsait

İlk olaraq bir faktı qeyd edək ki, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) yaradılmasının 90 illiyi münasibətilə ötən ilin yazında bu tanınmış ali təhsil müəssisəsinin professor-müəllim heyətinin əsərlərinin biblioqrafiyasının I hissəsi çap edilmişdi. Xatırladaq ki, həmin vəsaitin I hissəsinə vaxtilə ADPU-da işləmiş və eyni zamanda hazırda universitetdə çalışan professor-müəllim heyətinin 1921-1971-ci illərdə çap olunmuş kitab, məqalə, həmçinin konfrans və simpozium materialları daxil edilmişdir. Bu yaxınlarda isə həmin biblioqrafiyanın II hissəsi işıq üzü görmüşdür.

Qeyd edək ki, bu dəyərli biblioqrafiyanın ideya müəllifi ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov, elmi redaktoru isə Elmi işlər üzrə prorektor, filologiya elmləri doktoru, professor Vilayət Əliyevdir.

"Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyətinin 1921-2011-ci illərdə nəşr olunmuş əsərlərinin biblioqrafiyası" adlanan vəsaitin II hissəsində ADPU-nun 1972-ci ildən 2011-ci ilə kimi humanitar sahədə çalışan tədqiqatçılarının və alimlərinin elmi məqalələri toplanmışdır. Bu biblioqrafik vəsaitə Azərbaycan dili və ədəbiyyatına, Azərbaycan tarixinə, həmçinin ictimai elmlərin tədrisi metodikasına, eləcə də konfrans və simpozium materiallarına dair məqalələr daxil edilmişdir. 40 ildən artıq bir dövrü əks etdirən bu biblioqrafikvəsait üzərində ADPU-nun Elmi Kitabxanasının kollektivi 2 ildən çox vaxt ərzində gərgin və səmərəli iş aparmış və nəticədə sanballı bir biblioqrafik vəsait ərsəyə gətirmişdir. Onu da bildirək ki, 647 səhifədən ibarət bu biblioqrafiya ADPU-nun mətbəəsində yüksək poliqrafik səviyyədə çap edilmişdir.

Məlumat üçün onu da qeyd edək ki, yaxın zamanlarda adıçəkilən biblioqrafik vəsaitin III hissəsi çap ediləcəkdir. III hissəyə ictimai və humanitar elmlər sahəsində çap olunan kitablar və eləcə də xarici dillərdə çap olunmuş məqalələrin daxil edilməsi nəzərdə tutulur.

**Gülnar SÜLEYMANOVA,**
**Samir ƏZİZOV,**
**Tarix fakültəsinin tələbələri**

# 20 Yanvar şəhidləri anıldı

Xalqımızın qəhrəmanlıq tarixinin daha bir göstəricisi olan qanlı 20 Yanvar faciəsindən iyirmi üç il ötür. Bu qanlı yaddaş tarixi ADPU-nun professor-müəllim heyəti və tələbə kollektivi tərəfindən yanvar ayının 18-də Şəhidlər Xiyabanına ziyarətlə bir daha yad edilib.

Sonra tədbir universitetdə davam etdirilib. Tədbiri giriş sözü ilə ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev açıb. Öncə şəhidlərimizin ruhu bir dəqiqəlik sükutla anılıb.

Professor R.Baxşəliyev bildirib ki, Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri Ramiz Mehdiyevin müvafiq sərəncamı ilə ölkəmizdə "20 Yanvar faciəsinin iyirmi üçüncü ildönümünün keçirilməsi ilə bağlı tədbirlər planı" təsdiq edilmişdir. Həmin sərəncamda respublikamızın bütün şəhər və rayonlarında, o cümlədən müəssisə, idarə və təşkilatlarda 20 Yanvar hadisələri ilə bağlı toplantı, konfrans və mühazirələrin təşkil edilməsi, mədəniyyət ocaqlarında faciəyə həsr olunmuş tamaşaların göstərilməsi, bədii və sənədli filmlərin nümayiş etdirilməsi, bu tədbirlərin mətbuatda geniş işıqlandırılması, faciənin beynəlxalq ictimaiyyətin diqqətinə çatdırılması məqsədi ilə Azərbaycanın xarici ölkələrdəki səfirlikləri, diplomatik nümayəndəlikləri və Azərbaycan icmaları vasitəsi ilə müvafiq tədbirlərin həyata keçirilməsi, dünyanın aparıcı kütləvi informasiya vasitələrində, eləcə də televiziya kanallarında və İnternet şəbəkələrində 20 Yanvar faciəsi barədə materialların verilməsi nəzərdə tutulmuşdur. Eyni zamanda həmin sərəncamda 20 Yanvar hadisələri zamanı şəhid olanların ailələrinə humanitar yardımların verilməsi, Şəhidlər Xiyabanında təmizlik-abadlıq işlərinin aparılması və bütün təhsil müəssisələrində yanvarın 18-də faciəyə həsr olunmuş xüsusi dərslərin keçirilməsi, Azərbaycanda təmsil olunan əsas dini konfessiya və qurumlar tərəfindən faciə qurbanlarının xatirəsinə həsr olunmuş xüsusi dini mərasimlərin təşkil olunması öz əksini tapmışdır.

Bunlarla yanaşı, paytaxt ictimaiyyətinin yanvarın 20-də Şəhidlər Xiyabanına ziyarəti təşkil ediləcək, Bakı vaxtı ilə saat 12:00-da ölkə ərazisində şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad ediləcək, gəmilər, avtomobillər və qatarlar səs siqnalları verəcəkdir. Həmin gün həm də ölkə ərazisində matəm əlaməti olaraq Azərbaycanın dövlət bayraqları endiriləcəkdir. Artıq respublikamızda və bir çox xarici ölkələrdə 20 Yanvar faciəsinə həsr edilmiş müxtəlif tədbirlər həyata keçirilir.

Onu da qeyd etmək istəyirəm ki, Təhsil Naziri Misir Mərdanov bu il yanvar ayının 7-də 20 Yanvar faciəsinin iyirmi üçüncü ildönümünün qeyd edilməsi barədə əmr imzalamışdır. Həmin əmrə əsasən 20 Yanvar faciəsinin iyirmi üçüncü ildönümünün keçirilməsi ilə əlaqədar Təhsil Nazirliyinin tədbirlər planı təsdiqlənmişdir. Tədbirlər planına uyğun olaraq bu ilin 10-18 yanvar tarixlərində bütün təhsil müəssisələrində azadlıq uğrunda şəhid olmuş soydaşlarımızın xatirəsinə həsr edilmiş geniş tədbirlərin keçirilməsi qeyd edilmişdir.

Yuxarıda qeyd etdiyim sənədlərə əsasən ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov bu il yanvar ayının 10-da ADPU-da 20 Yanvar faciəsinin iyirmi üçüncü ildönümünün keçirilməsi ilə əlaqədar tədbirlər planının təsdiq edilməsi barədə müvafiq əmr imzalamışdır. Həmin əmrdə 11-20 yanvar tarixlərində universitetimizin bütün fakültə və şöbələrində 20 Yanvar hadisələrinin səbəbləri, həmçinin həmin dövrdə xalqımıza qarşı xain mövqe tutmuş xarici və daxili qüvvələrin fəaliyyətinin təhlili, eləcə də tələbə-gənclər arasında vətənpərvərlik mövzusunda xüsusi söhbətlərin aparılması, xüsusi qəzetlərin, bülletenlərin buraxılması, stendlərin, guşələrin yaradılması və bu mövzuda mühazirələrin təşkil edilməsi göstərilmişdir. Bu gün bütün fakültələrdə 20 Yanvar faciəsinə həsr edilmiş xüsusi dərslər keçirilmiş, hadisələrin mahiyyəti və faciənin başvermə səbəbləri haqqında tələbə-gənclərə ətraflı məlumat verilmişdir. ADPU-nun Kompyuter Mərkəzi faciənin ildönümünü ərəfəsində universitetin İnternet şəbəkəsinə və saytına 20 Yanvar faciəsini əks etdirən materialları daxil etmişdir.

Professor R.Baxşəliyev çıxışında 1990-cı il




yanvar ayının 19-dan 20-nə keçən gecə imperiya ordusunun Bakıda zorakılıq tətbiq etməklə xalqımıza qarşı cinayət törətdiyini, qanlı 20 Yanvarın Azərbaycanın müasir tarixinə ən faciəli günlərdən biri, eyni zamanda xalqımızın qəhrəmanlıq səhifəsi kimi daxil olduğunu deyib. Həmin gecə 147 nəfər soydaşımız amansızcasına qətlə yetirilmiş, 800 nəfər yaralanmış, 841 nəfər isə qanunsuz olaraq həbs edilmişdir. Onu da qeyd edim ki, universitetimiz milli müstəqilliyimiz və ərazi bütövlüyümüz uğrunda gedən mübarizədə 16 nəfər şəhid verib. Onlardan 2-si xüsusi şücaət və qəhrəmalıqlarına görə ölümündən sonra Azərbaycanın Milli Qəhrəmanı adına (M. İbrahimov və M.Quliyev), 2-si isə "Azərbaycan Bayrağı" ordeninə (M.Məmmədov və M.Bayramov) layiq görülüb.

Professor R.Baxşəliyev həm də öz çıxışında doğma yurdunun, xalqının azadlığını hər şeydən uca tutan Vətən oğullarının həmin müdhiş gecədə canlarından keçərək şəhidlik zirvəsinə ucalmaqla xalqımızın iradəsinin ifadəçisi olduğu söyləyib.

Eyni zamanda professor R.Baxşəliyev Bakıda törədilən bu qanlı qətliamın ertəsi gün-yanvarın 21-də ulu öndər Heydər Əliyevin Azərbaycanın Moskvadakı nümayəndəliyinə gələrək Sovet rəhbərliyini kəskin ittiham edən bəyanat verdiyini və xalqımızın haqq səsini bütün dünyaya çatdırmasını bir daha tədbir iştirakçılarına xatırladıb.

Ümumi tarix kafedrasının dosenti Səmayə Mustafayeva tədbirdə məruzə edib. Dosent S.Mustafayeva məruzəsində qanlı 20 Yanvar hadisələrinin başverməsəbəblərini açıqlayıb.M.Qorbaçovun və Sovet imperiyasının Bakı qətliamını törətməklə Azərbaycan xalqına qarşı cinayət işlədiyini söyləyən məruzəçi bildirib ki, imperiya bu cinayəti törətməklə əslində, öz mövcudluğunu qorumağa çalışırdı.

Dosent S.Mustafayeva çıxışının sonunda "1990-cı ilin 20 Yanvarı Azərbaycan xalqına hansı dərsləri verdi?" sualını cavablandırıb, eyni zamanda 22 ildir ki, müstəqil dövlət olan Azərbaycanımızın bu gün respublika Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında hüquqi, demokratik, dünyəvi dövlət quruculuğu yolunda inamla irəlilədiyini diqqətə çatdırıb.

Sonda "Dədə Qorqud" elmi-tədqiqat laboratoriyasının böyük elmi işçisi, dosent, Azərbaycan Yazıçılar Birliyinin üzvü, şair Oqtay Rza qanlı 20 Yanvara, eləcə də ADPU-nun şəhid məzunu İlqar Məmmədrza oğlu Cəfərliyə həsr etdiyi şeirini oxuyub.

## İ L Q A R

Müqəddəs Şəhidlər xiyabanında,
Ehram qəbirlərin durub yanında
Özümü didərgin, qərib sanıram,
Tüstüsüz yanıram, alovlanıram.
Gün yenə pərişan, tutqun səhərli,
Yenə məzarların sırası artır;
Birində ən əziz tələbəm yatır -
İlqar Məmmədrza oğlu Cəfərli.
... Ev-eşik hazırlıq görürdü toya,
Ocağı eşqindən od alacaqdı;
Hələ harasıdır, iki-üç aya
Alim olacaqdı, ad alacaqdı.
Kitabı - "Kimyadan sınaq dərsləri",
Çap üzü gözləyir nə vaxtdan bəri.
Payız idi.
İlqar dedi:
-Lap qudurub qəddar yağı.
Mən getməsəm,
Sən getməsən,
Biz getməsək,
Bəs onda kim,
Kim qorusun Qarabağı!?
...Dözməyib tökülən nahaq qanlara,
Könüllü qoşuldu qəhrəmanlara.
Neçə yırtıcını torpağa sərən,
Döst üçün köksünü qabağa verən,
Kiçicik alaya sərkərdə İlqar...
Dərmandı, çarəydi çox dərdə İlqar.

...Gün yenə pərişan, tutqun səhərli,
Yenə məzarların sırası artır:
Birində ən əziz tələbəm yatır -
İlqar Məmmədrza oğlu Cəfərli.

**Ayətxan ZİYATXANOĞLU**



**Bu yaxınlarda dövlət səviyyəsində 80 illik yubileyi keçirilən Azərbaycanın xalq şairi Xəlil Rza Ulutürk zamanında Pedaqoji Universitetdə uşaq ədəbiyyatı fənnindən dərs deyib. Böyük şairin xatirəsi bu gün də tələbələrinin yaddaşında yaşamaqdadır.**

## Xəlil Rza Ulutürkə

Ucaboylu, enlikürək,
şux qamətli, gözəl-göyçək,
irigözlü, dirigözlü
Xəlil Rza.
Şeirləri titrədirdi
salonları,
Düşməniydi
yaltaqların, qorxaqların.
Danışanda
görəydiniz sizlər onu.
Hər kəlməsi qasırğaydı,
tufan idi.
Düz söz demək igidlikdi -
Zaman elə zaman idi.
İti sözü, qəti sözü
yayılırdı ürəklərə,
Elə bil ki, sarı yağdı.
Əritdilər sözlərini,
bir qram da ərp çıxmadı.
Onun qızıl sözlərinin
heç biri də qəlp çıxmadı.
Məclislərə şölə salan
çıraq idi, igid idi,
qorxmaz idi, qoçaq idi.
Məhəbbəti çiçək kimi
təzə-tərdi, qəşəng idi.
Nifrətisə ildırımdı,
güllə idi, fişəng idi.
O zaman ki qaniçənlər
şahə qalxdı, azğın oldu,
Xəlil Rza qartallaşdı,
quzğun oldu.
Od yağanda başımıza
od püskürdü Xəlil Rza.
Baxıb gördük Yanar dağdı,
Dəli Kürdü Xəlil Rza.
Lefertovo zindanında
çıraq oldu işıq saçdı.
Azərbaycan gəncliyinə
mayak oldu.
Ona görə bu torpaqdan
zülmət qaçdı...

Təkbaşına yarıb keçdi
tufanları Xəlil Rza.
Mənim gənclik illərimin
Dostu, yarı Xəlil Rza.

**Zahid Xəlil,**
**ADPU-nun Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor,**
**Azərbaycan Yazıçılar Birliyinin üzvü, şair**

# Xeyirxah aksiya

Yanvar ayının 7-də Sumqayıt şəhərində sığınacaq tapmış məcburi köçkün ailələrindən olan uşaqların Yeni il bayramını təbrik etmək məqsədilə YAP-ın ADPU Qadınlar Şurası Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin Saray qəsəbəsində yerləşən fiziki və əqli cəhətdən qüsurlu uşaqların məskunlaşmış olduqları 7 saylı İnternat Evində tədbir keçirib.

Universitet müəllim və tələbələrinin hazırladıqları ssenari balacalar tərəfindən rəğbətlə qarşılanıb. Yeni illə bağlı səhnəciklər, öyrədici xarakterli maraqlı viktorinalar nəinki uşaqlar, böyüklər tərəfindən də alqışlarla qarşılanıb.

Tədbiri giriş sözü ilə universitetin kadrlar şöbəsinin rəisi Nigar Rəhimova açıb. YAP-ın ADPU Qadınlar Şurasının sədri, dosent Laçın Həsənova çıxış edərək aksiyanın məram və məqsədini açıqlayıb, balacalara universitet rəhbərliyinin Yeni il təbriklərini çatdırıb. Görüşdə həmçinin Azərbaycana Birgə Yardım Təşkilatının nümayəndəsi və 7 saylı İnternat Evinin direktoru Qətibə Əsədova çıxış edərək belə aksiyaların əhəmiyyətindən, balacaların, xüsusilə qayğıya ehtiyac duyan fiziki və əqli cəhətdən qüsurlu uşaqların həyata baxışlarında oynadığı roldan bəhs ediblər.





Bayram tədbirində Yeni il barədə balacalara müfəssəl məlumat verilib. Şənliyin gedişinə məcburi köçkün ailələrindən olan uşaqlarla bərabər 7 saylı İnternat Evində tərbiyə alan uşaq və yeniyetmələr də qatılaraq şeir söyləyib, mahnı oxuyublar.

Rəqslər və nəğmələrlə müşayiət olunan müsabiqələr nəinki balacaların, onların valideynlərinin, tədbirdə fəallıq göstərən 7 saylı İnternat Evi kollektivinin də böyük marağına səbəb olub. "Xəzər" və "Neftçi" adlandırılmaqla iki komandaya bölünən uşaqlar müxtəlif viktorinaların iştirakçısına çevriliblər.

Uşaqların hamısı YAP-ın ADPU Qadınlar Şurasının hədiyyələri ilə mükafatlandırılıb. Azyaşlıların dünyagörüşünü və hazırcavablığını nümayiş etdirən bilik yarışmasının qaliblərinə - sualları düzgün və dolğun cavablandıranlara isə xüsusi hədiyyələr təqdim olunub.

Şənlikdə ADPU musiqi kollektivinin üzvü, gənc müğənni, "Xalq ulduzu-5" mahnı müsabiqəsinin qalibi Sara Şirinovanın ifasında nəğmələr səsləndirilib.

Sonda Azərbaycana Birgə Yardım Təşkilatının nümayəndəsi və 7 saylı İnternat Evinin direktoru Qətibə Əsədova çıxış edərək bu aksiya üçün ADPU-nun rəhbərliyinə, həmçinin YAP-ın ADPU Qadınlar Şurasına, eləcə də bayram tədbirini balacalara təqdim edən Pedaqoji Universitetin tələbə və əməkdaşlarından Aydan Ağamirzəyevaya, Nüsrət Mehdiyevə, Çinarə Abbaslıya, Vüsalə Hüseynovaya, Kamal Xudaverdiyev və Nicat Qəhrəmanzadəyə minnətdarlıqlarını bildiriblər.

**A.İSGƏNDƏROV**

# ADPU ilə bağlı 60 il

## Dünyabəyim Əfəndiyeva - 80

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının müəllimi Dünyabəyim Əfəndiyeva ilə az da olsa tanışlığı olan hər kəs onun barəsində belə düşünür. Axı onun 80 illik həyatının 60 ili məhz bu tanınmış və nüfuzlu ali təhsil müəssisəsi ilə bağlıdır. Hərdən 80 illik zaman məsafəsindən çevrilib geriyə baxdıqda ADPU ilə qoşa addımlamış 60 illik yaşamı ilə qürur duyur. Niyə də qürurlanmasın?! Axı onun dördillik tələbəlik ömrü də, sonrakı əmək fəaliyyəti də təhsil aldığı fakültənin həyatı ilə sıx bağlıdır. İctimai fəallığı həmişə göz önündə olub: fakültə tələbələrinin cəm edildiyi dərnəklər, bilik yarışmaları, konsertlər, "Şən və hazırcavablar klubu"-nun ürəkləri riqqətə gətirən səhnəcikləri...

Dünyabəyim müəllimənin ürəyini dağa döndərən, varlığını riqqətə gətirən başqa bir amil bu gün Azərbaycanda pedaqogika elmini yaradanların, bu elmin davamçılarının, yaşadanlarının müəyyən bir qisminin ilkin mərhələ olaraq onun müəllimi, sonrakı dövrdə çiyin-çiyinə çalışdığı iş yoldaşı və nəhayət həmkarı olmasıdır. Bu sırada kimləri görməzsiniz?!

**Tanışlıq:**

**Əfəndiyeva Dünyabəyim Teymur qızı 1933-cü il mart ayının 25-də Şamaxı şəhərində anadan olub. 1 saylı orta məktəbin 8-ci sinfini müvəffəqiyyətlə bitirib. Şamaxı şəhər M.Ə.Sabir adına Pedaqoji Texnikuma daxil olub. Həyatının 1953-cü ildən sonrakı dövrü isə Azərbaycan Dövlət Pedaqoji İnstitutu(indiki ADPU) ilə bağlıdır. Belə ki, həmin il Coğrafiya fakültəsinin tələbəsi adını qazanıb. İctimai fəallığı fakültə rəhbərliyinin diqqətindən yayınmayıb. İlk ictimai işi qrup komsomol təşkilatının katibi olub.**

Həm tələbəlik illərində, həm də sonrakı dövrdə daim müəllimlərinin qayğısını öz üzərində hiss edib. Belə ki, I kursda qrup komsomol təşkilatının katibi seçilməsi fakültə partiya təşkilatının katibi olan İsmayıl Vəlixanlının, II kursda fakültənin dərnək rəhbəri tövsiyə edilməsi isə fakültənin dekanı, professor Zaraxanım Şahtahtinskaya ilə dekan müavini, dosent Məmməd Zülfüqarovun təşəbbüsü iləolub. Bu seçim tələbə Dünyabəyimin kimliyinin aşkarlanmasında mühüm rol oynayıb. Bacarığı, fəallığı ilə fərqlənən tələbələrdən ibarət böyük bir dəstə yarada bilib ki, bu dəstənin fakültənin ictimai həyatında oynadığı rol haqqında bu gün də ürəkdolusu danışmaq mümkündür.

Hər ay keçirilən dərnəklər, bilik yarışmaları, konsertlər, ədəbi-bədii viktorinalar... Hamısının da təşəbbüsçüsü, təşkilatçısı D.Əfəndiyeva olub. Təhsilini başa çatdırana qədər institutun akt zalında keçirilən yığıncaqların ərsəyə gəlməsi kimi məsuliyyətli bir işə o rəhbərlik edib. Tələbəlik illərinin yadigarları olan fakültə və institut rəhbərliyinin imzası ilə ona təqdim olunmuş təşəkkürnamə və fəxri fərmanları bu gün də əziz xatirə kimi qoruyub saxlayır.

1957-ci ildə ali təhsilini başa çatdırıb. Sonrakı dərs ilində Zoologiya kafedrasında laborant kimi əmək fəaliyyətinə başlaması 25 yaşlı D.Əfəndiyevanı ADPU-ya birdəfəlik bağlayıb. Bir müddət həmin fakültədə metodist, az sonra isə professor Şövqi Ağayevin qayğısı sayəsində İbtidai təhsil və məktəbəqədər fakültəsində baş metodist kimi əmək fəaliyyətini davam etdirib. Fakültənin əyani şöbəsində saat hesabı dərs də aparıb. Təqribən bir il işləyəndən sonra - 1969-cu ildə Coğrafiya fakültəsinə müəllim keçirilib. Bu addımlarındakı irəliləyişləri professor Ş.Ağayevin qayğısı sayəsində mümkün olub.Elə o vaxtdan bu günə qədər - düz 44 ildir ki, həmin fakültənin müəllimidir.

Mərhum akademiklər Həsən Əliyev və Budaq Budaqovun 54 saylı məktəbdə pedaqoji təcrübə müddətində hazırladığı Coğrafiya gecələrinin münsiflər heyətinin rəhbəri olmaları xoş xatirətək yaddaşında yaşayır. Bu sıraya Rima Hənifəyeva, Həsən Sadıqlı, Nizaməddin Allahverdiyev, Əsəd Əsədov və bir çox başqalarını da daxil etsək, Dünyabəyim müəllimənin həqiqətən qürur dolu ömür yaşadığını söyləməkdə haqlı olduğunu görərik. Bu gün artıq ADPU-nun yaddaş tarixinə çevrilmiş bir sıra tanınan alim-müəllimlərin onun müəllimi olmasından, həmçinin beləleri ilə bir sırada müəllimlik fəaliyyəti ilə məşğul olmasından



və belələrini şəxsən görüb-tanımasından niyə də qürurlanmasın?!

Dindirsən, həmsöhbət olsan ADPU ilə bağlı 60 illik ömür tarixçəsinin yaddaşına, yazılı şirin, xoş xatirələri ilə baş-başa qalarsan. Necə ki, yola saldığı illərin şirin ovqatı ilə məni də xatirələrinin qoynunda yaşatdı.

***

Uzun illər fakültənin pedaqoji təcrübə rəhbəri olub. 247, 54, 53, 3, 190 saylı və digər məktəblərdə pedaqoji təcrübədə metodist kimi fəaliyyəti həmişə yüksək qiymətləndirilib.

D.Əfəndiyevanın yaddaşından: "Daha sıx əlaqəm 54 saylı orta məktəblə olub. Bu məktəbdə uzun müddət pedaqoji təcrübə rəhbəri olmuşam. Tələbələrimiz öyrənməyə, biliklərini nümayiş etdirməyə çox həvəsli idilər. Məktəbdə hər il iki dəfə coğrafiya gecəsi təşkil edirdim.Bu fəaliyyətim fakültə ilə məktəb arasında əlaqələrin daha da sıxlaşmasına səbəb oldu. Hər dəfə pedaqoji təcrübənin sonunda tələbələrimizin işi təşəkkürnamələrlə qiymətləndirilirdi. Akademik Həsən Əliyev və akademik Budaq Budaqov gecələrin münsiflər heyətinin sədri olur, fakültənin fəal tələbələrinin işini qiymətləndirirdilər. Məktəbin direktoru Rima Hənifəyeva ilə bu gün də isti münasibətlərimiz davam edir. Fakültə Qadınlar Şurasının nümayəndəsi və institut Qadınlar Şurasının üzvü kimi də fəaliyyətim olub.

Fakültəmizdə bayramların keçirilməsi, məzunlarımızın tarixi abidələrimiz Qobustana, Xan sarayına, Quba rayonuna, Şüvəlan gülçülük sovxozuna ekskursiyaları, şair və yazıçılarımızla, müharibə veteranları ilə keçirilən görüş və gecələrdə xüsusi fəallığım həmişə qeyd edilib. Sevilən şair, Azərbaycan Yazıçılar Birliyinin üzvü, ADPU-nun dosenti Oqtay Rza ilə dəfələrlə Coğrafiya gecələri keçirmişik. 1988-1996-cı illərdə fakültəmizdə Tərbiyə işləri üzrə dekan müavini vəzifəsində işləmişəm. Bu illər ərzində rektorluq tərəfindən dəfələrlə təşəkkürnamələrə layiq görülmüşəm. Mərhum dekanımız Mustafa Əliyev, Əsəd Əsədov və Yavər Əliyev institutumuzun "Gənc müəllim" qəzetində haqqımda məqalələrlə çıxış ediblər. Əməyim təkcə son 6 ildə ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov tərəfindən 4 dəfə təşəkkürnamə və pul mükafatı ilə dəyərləndirilib.

Pedaqoji fəaliyyətlə məşğul olduğum illər ərzində 40-a qədər elmi məqalənin, proqramların müəllifiyəm, "Pedaqoji təcrübə üçün metodiki vəsait" adlı kitabım nəşr edilib".

***

...Bu, 80 illik həyatının 60 ilini 92 yaşlı universitetimizlə sıx bağlayan, universitetimizin inkişaf yolunu pillə-pillə öz gözləri ilə görən və ADPU-nun keçdiyi tərəqqi yoluna imkanları daxilində öz payını verən, ömrünün 44 ilini respublikamız üçün müəllim kadrları hazırlanması kimi müqəddəs bir işə həsr etmiş D.Əfəndiyevanın gəncliyə örnək göstəriləsi ömür yolu barədə qeydlərdir ki, oxuculara təqdim etdim. Belə insanları tanımaq, onların həyat yolunu öyrənmək, bəhrələnmək hər birimiz üçün gərəklidir. Xüsusən də, müəllim peşəsini özü üçün həyat yolu seçən gənclərimiz üçün. Dünyabəyim müəllimə haqqında elə bu niyyətlə söhbət açdım.

Dünyabəyim müəllimənin adına hörmət və ehtiramla:

**Mətanət Əsgərova,**
**Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent**

# SABİRŞÜNASLIĞA DƏYƏRLİ TÖHFƏ

***Professor Tərlan Novruzovun "Sabirşünaslıq Azərbaycanda və xaricdə" kitabına söz***

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Dünya ədəbiyyatı kafedrasının müdiri, filologiya üzrə elmlər doktoru, professor Tərlan Novruzovun çoxşaxəli elmi fəaliyyətinin zəngin bir hissəsi M.Ə.Sabirə - dünya ədəbiyyatının ən nəhəng ədəbi şəxsiyyətlərindən birinə həsr olunmuşdur. Mütəfəkkir şairin yaradıcılığına sonsuz məhəbbətin kökündə M.Ə.Sabirlə bağlı ədəbi-bədii faktların dərindən mənimsənilməsi, zəngin poetik materiallarına hərarətli münasibət dayanır. Sabir yaradıcılığını yüksək ilham və məsuliyyət hissi ilə tədqiq etmək, onu ürəkdən, xüsusi şövq və həvəslə araşdırmaq həm də M.Ə.Sabir poeziyasını, onun daxili mündəricəsini xüsusi həssaslıqla duymağın, onu bütün estetik incəlikləri, bədii təfərrüatları ilə qavramağın bilavasitə ifadəsidir.

Professor T.Novruzovun çoxsaylı elmi məqalələri, M.Ə.Sabir irsini öyrənən monoqrafiyaları sübut edir ki, onun M.Ə.Sabir irsini bədii-estetik və nəzəri məsələlərini öyrənmək sahəsindəki çoxillik səmərəli tədqiqat təcrübəsi, tədqiqatçının dahi satira ustadının yaradıcılığına güclü daxili mənəvi ehtiyacın, yaradıcılıq ehtirasının nəticəsidir. Onun «Sabir irsinin tədqiqi və təbliği», «M.Ə.Sabir ədəbi məktəbi», «Mirzə Ələkbər Sabir (tədqiqi tarixindən)», «Sabir və davamçıları», «M.Ə.Sabir ensiklopediyası», «M.Ə.Sabir: axtarışlar, tapıntılar», «Sabir-150. Davam edən ənənələr» adlı monoqrafiyaları mövzu aktuallığı və problematikası ilə seçilir. Bu monoqrafiyaların hər birində sabirşünaslığın spesifik yaradıcılıq məsələləri, bu məsələlərin öyrənilməsi sahəsində Azərbaycan ədəbiyyatşünaslığının zəngin təcrübəsi ümumiləşdirilmiş və mübahisəli məsələlərə, polemik məqamlara münasibət bildirmək təşəbbüsü göstərilmişdir. Xüsusi qeyd olunmalıdır ki, bütün hallarda Tərlan Novruzov araşdırdığı sabirşünaslıq problemlərinin ən səciyyəvi xüsusiyyətləri haqqında canlı təsəvvür yaratmaq, fikir və mülahizələrini əsaslı elmi arqumentlərlə inandırmaq yolu ilə getmişdir. Bu məziyyət müəllifin yenicə çapdan çıxdığı «Sabirşünaslıq Azərbaycanda və xaricdə» monoqrafiyasına da aiddir.

Müəllif bu yeni əsərində M.Ə.Sabir haqqında yalnız ölkəmizdə yazılan araşdırmalarla kifayətlənməmiş, respublikamızın hüdudlarından kənarda da qələmə alınmış çoxsaylı tədqiqatlardan bəhrələnmiş, mövzunu professional keyfiyyətlərlə zənginləşdirilmişdir. Təqdirəlayiqdir ki, Sabirşünaslıqla bağlı tədqiqatların dairəsi genişləndikcə, professor T.Novruşov da dahi şairin tədqiqi problemlərinin öyrənilmə dairəsini genişləndirmişdir. Böyük şairin analoqu olmayan satira yaradıcılığının poetik mahiyyətini, daxili estetik gözəlliklərini bütün incəlikləri ilə dərk edən Sabirşünas alim müntəzəm izlədiyi Sabir irsinin tədqiqinə dair ən mühüm yazıların geniş təhlilini verərək bu araşdırmaların əsas konseptual meyllərini və keyfiyyətlərini ümumiləşdirmişdir.

«M.Ə.Sabir inqilabdan əvvəlki ədəbi fikirdə» adlı birinci fəsildə hələ böyük sənətkarın sağlığında Sabir fonomeninə canlı maraqdan, onun satirik yaradıcılığına münasibətdən, Sabir qələmindən çıxan novator ruhlu şeirlərin doğurduğu əks-sədadan ətraflı söhbət açılmışdır. Müəllif Sabirin ayrı-ayrı əsərlərinə şəxsi münasibət bildirən təəssürat xarakterli yazılardan tutmuş bu ədəbi nümunələri böyük hadisə sayıb onun ideya mündəricəsinə, xəlqilik və realizm keyfiyyətlərinə, novatorluq və üslub yeniliyinə, ifadə tərzinə, poetik mətnlərin semantikasına və estetik təbiətinə və s. ayrıca diqqət yetirən ciddi elmi-tədqiqat işlərinə xüsusi həssaslıqla nüfuz edərək əsl tədqiqatçı mövqeyinin fəallığını nümayiş etdirmişdir. Sabir haqqında birinci yazanlar - Ə.Hüseynzadə, Ü. Hacıbəyov, A.Şaiq, T.Şahbazi, Ə.Haqverdiyev, M.Hacınski, A.-Minasazov, A.Səhhət, Ə.Fəhmi, Qafar Rəşad, F.Köçərli, S.Hüseyn, Y.V.Çəmənzəminli və digərləri sabirşünaslığın təməlini qoyan müəlliflər kimi səciyyələndirilmiş, Sabir irsinə fərqli yanaşmalarına baxmayaraq, onların xatirə və məqalələrinə, ədəbi-tənqidi qeydlərinə obyektiv qiymət verilmişdir.

İstər sağlığında olsun, istər ölümündən sonra-professor T.Novruzov Sabirin ədəbi irsi ətrafında ilk elmi-tədqiqat axtarışlarının sabirşünaslığın bünövrəsini təşkil etdiyi fikrindədir. Buna görə də o, şairin ədəbi irsinin bədii-estetik əhəmiyyətinin düzgün idrakında barəsindəki ilk yazılara obyektiv mövqedən yanaşır və onlardakı bəzi çatışmazlığa münasibət bildirir. Müəllif, Sabir haqqında Böyük Oktyabr sosialist inqilabından qabaqkı tənqidin əsas uğuru olaraq dahi söz sənətkarını «dərhal xalqın ictimai fikrinə daxil olmuş sənətkar» kimi xarakterizə edir.

M.Ə.Sabir irsinin öyrənilməsində yeni istiqaməti tədqiqatçı, dahi sənətkarın bədii yaradıcılığının elmi təhlilini geniş nəzəri aspektdə araşdıran məşhur alimlərin əsərləri əsasında müəyyənləşdirir. 1920-1930-cu illərdə meydana çıxan araşdırmalarda Sabir irsinə yeni ideya-metodoloji prinsiplərlə yanaşma meyllərinin güclənməsini tutarlı dəlillər və inandırıcılıqla əsaslandıraraq sabirşünaslıqla bağlı fikir və mülahizələri yeni keyfiyyət həddinə çatdırır. Sabirşünaslığın nəzəri üfüqlərini genişləndirməkdə xüsusi xidmətləri olan N.Nərimanov, M.S.Ordubadi, B.Çobanzadə, A.Musaxanlı, M.Ələkbərli, Ə.Şərif, Ə.Nazim, H.Araslı, S.Şamilov, Ə.Dəmirçizadə və digər nüfuzlu qələm sahiblərinin irəli sürdüyü əsas elmi müddəaları təhlil süzgəcindən keçirərək müəllif natamam qənaətlərlə tamamlanan, Sabir yaradıcılığının rəngarəngliyini tam əks etdirməyən yazılara tənqidi münasibət bildirmişdir. Professor T.Novruzovun tədqiqatında Sabirin ədbiyyatımızda mövqeyi, əsərlərinin ictimai məzmununun açılması ilə bağlı fikir ayrılıqlarının doğurduğu polemika müstəsna bir aydınlıqla ümumiləşdirilmiş, bəzi metodoloji qüsurlar, qeyri-elmi, ziddiyyətli fikirlər, əsassız ifratçılıq hallarının kökləri bu problemlərə yüksək nəzəri baxışlarla işıqlandırılmışdır.

Professor T.Novruzovun sabirşünaslıqla bağlı tədqiqatının 1920-30-cu illər dövrü səmərəliyi və məhsuldarlığı ilə diqqət çəkir. Başqa sözlə, T.Novruzovun bu dövr sabirşünaslıqda mövcud olan problemlərin düzgün başa düşülməsində, lazımi səviyyədə dərk olunmasında fəal və kəskin mövqeyi mühüm amil kimi çıxış edir, yüksək elmi-nəzəri səviyyəsi ilə diqqət çəkir.

1920-30-cu illər sabirşünaslığın bir sıra vacib tərəflərini mükəmməl və dolğun əhatə edən T.Novruzov bu dövr Sabir yaradıcılığı ilə əlaqədar axtarışları mənalandırmaq təşəbbüsü ilə Sabir irsini, onun ideya-estetik keyfiyyətlərini təyin etmək baxımından, Sabir yaradıcılığının ən vacib komponentlərinin, xüsusilə metod, üslub, forma və s.




problemlərin poetik mündəricəsi ilə əlaqəsi və vəhdətini, poetikasının kamillik dərəcəsini şərh etmək nöqteyi-nəzərindən, sənətkarın yaradıcılıq siması və bədii idrak prinsiplərini dolğun və kamil şəkildə əks etdirmək yönümündən səmərəli fəaliyyət göstərmiş, Sabir yaradıcılığının mahiyyəti və özünəməxsusluğu, estetik məziyyətləri haqqında bitkin mövqeyini nümayiş etdirmişdir.

Sabirşünaslıqdakı inkişafın vəhdətini nəzərdən qaçırmayan müəllif hər bir inkişaf mərhələsinin ayrı-ayrı təmayüllərini konkret detallar, ədəbi faktlarla mənalandırır. Sabirşünaslığın keyfiyyət dəyişəkliyini, elmi təfəkkürdəki struktur təbəddülatları diqqətlə izlənir ki, bu da T.Novruzovun sabirşünaslığa, onun real mənzərəsinə və tədqiqatlardakı təmayüllərə verdiyi təhlilin məğzini və pozitiv tərəfini təşkil edir. T.Novruzov qeyd edir ki, sabirşünaslığın yetkin səviyyəsi öz başlanğıcını məhz 1920-ci illərdən götürmüşdür. Belə ki, Sabir yaradıcılığının köklü problemlərini tədqiq etmək üçün bu dövrdə kifayət qədər zəngin təcrübə toplandı və bu təcrübə Sabir irsini küll halında elmi şəkildə işıqlandırmaq işində kara gəldi. O, tamamilə düzgün müşahidə edir ki, «Otuzuncu illərin sabirşünaslıq təcrübəsi nə qədər qiymətli olsa da, bu böyük sənətkarın yaratdığı, poeziyanın dərin bədii təhlilini vermək yolunda ancaq mühüm bir mərhələ sayıla bilər. Sabir irsinin milli poetik mədəniyyətin tarixində yüksək bir zirvə olmasını sübut etmək üçün onun irsinin təhlilini dərinləşdirmək lazımdır və bu zərurət sonrakı dövrlərdə sabirşünaslığın inkişafında keyfiyyət həddinə çatmasına təkan verdi. Bu mühakimənin məntiqi «Sabirşünaslıq inkişafda (1940-50-ci illərdə)», «M.Ə.Sabir irsinin tədqiqinin müasir mərhələsi (1960-70-ci illər)» və «M.Ə.Sabir irsi son araşdırmalarda» adlı fəsillərdə özünü bütün cəhətləri ilə doğrultmuşdur. Sözün tam və dürüst mənasında sabirşünaslığın təşəkkül və inkişaf mənzərəsinin bütün cizgilərini göstərməyə çalışarkən T.Novruzov bu mənzərənin aparıcı meyllərindən bəhs etməklə bərabər sabirşünaslığa dair qəzet resenziyalardan tutmuş irihəcmli monoqrafiyalara, fəlsəfə doktoru və doktorluq dissertasiyalarına qədər bütün diqqətçəkən yazılardan danışmağa üstünlük vermişdir. Cəfər Xəndan, Mir Cəlal, Əziz Mirəhmədov, C.Cəfərov, M.Ağamirov, Ə.Cəfər, M.Məmmədov və digər müəlliflər nisbətən ətraflı təqdim olunmuşdur.

M.Ə.Sabir ədəbi məktəbinin ideya-estetik əsaslarını və Sabir poeziyasının bədii pafosunu tədqiq edən müəlliflərin fikirlərinə istinad edən T.Novruzovun əsas elmi arqument və tezisləri əsaslandırılmış formalarda meydana çıxır. O, Sabir ədəbi məktəbinin möhtəşəmliyindən, qüdrətindən xüsusi coşqunluqla bəhs edir. Buna görə də müəllifin Sabir dühasına obyektiv yanaşma və qiymətvermə ölçüləri güclü tərəfləri ilə yaddaşa köçür. Tədqiqatlara yüksək estetik prinsiplərdən yanaşma, haqqında söhbət açdığımız monoqrafiyanın ruhunu və əsas istiqamətini təşkil edir.

Kitabın qiymətli məziyyətlərindən biri də Sabirin respublikamızdan kənarda yayılmış şöhrətini genişmiqyaslı təhlildən keçirmək niyyətinin reallaşmasıdır. «Sabir irsi xaricdə» fəsli bütövlükdə sabirşünaslığın coğrafi koordinatlarının genişliyinə, ayrı-ayrı ölkələrdə Sabir irsinə maraq, onun əsərlərinin tərcüməsi və nəşri, ədəbi təsir qüdrəti və s. məsələlərin tədqiqinə həsr olunmuşdur. Keçmiş SSRİ məkanında, İranda, Türkiyədə, İraqda Sabir irsinə maraq, əsərlərinin yayılma arealı, təhlili və təbliği ilə bağlı faktlardan geniş söz açılmışdır ki, buna da müəllifin müasir elmi-metodoloji münasibəti aydın hiss olunur.

Göründüyü kimi, professor T.Novruzov Sabir irsi və onun öyrənilməsi ilə bağlı araşdırmalarını son illər daha da genişləndirmişdir. O, ədəbiyyatşünaslığımızın son nailiyyətlərindən, ədəbi tənqidin qazandığı uğurlarından çıxış edərək Sabirin poetik dünyasına qabaqcıl estetik meyarlarla aydınlıq gətirmişdir. Müxtəlif zaman və məkanda ərsəyə gələn mövcud elmi-tədqiqat işlərini xüsusi qayğı və zəngin səriştə ilə sabirşünaslığın köklü problemləri ətrafında mərkəzləşdirməyə müvəffəq olmuşdur. Sabirşünaslığın yarandığı vaxtdan bu günə qədər əldə etdiyi bütün uğurları xüsusi həssaslıqla saf-çürük etməklə yanaşı müəllif ayrı-ayrı tarixi dövrü, ədəbi gerçəkliklərin tələblərini nəzərdən qaçırmamış, hər bir tədqiqat əsərinə böyük estetik ölçülərlə yanaşmış, başqa sözlə, əsl ədəbiyyatşünas, vətəndaşlıq təəssübkeşliyi və M.Ə.Sabirə sonsuz pərəstişkarlıq ehtirası ilə problem səciyyəli məsələləri diqqət mərkəzinə çəkmişdir. Bununla da sabirşünaslığı daha mükəmməl və öyrənilməsi zəruriyyət doğuran istiqamətə yönəltməyə güclü səy göstərmişdir. Bu istiqamət isə, müəllifin nəzəri düşüncələrinin, estetik təfəkkürünün ən sağlam və kamilləşməsi yoludur. Bu istəkdən irəli gələrək T.Novruzovun sabirşünaslıqla bağlı bütöv estetik konsepsiyasında Sabir sənətinin qüdrətinə layiq olan dəyəri vermək qayəsi açıq-aşkar diqqət çəkir.

«Sabirşünaslıq Azərbaycanda və xaricdə» monoqrafiyasının məziyyətləri göstərir ki, Sabirin həyat və yaradıcılığı, daxili qayəsi, poetikası, sənətkarlığı və s. ilə bağlı T.Novruzovun elmi fəaliyyətində vüsətli təfəkkürlə, geniş mənalarla düşünmək olduqca səciyyəvidir.

Bu əsər Sabir sənəti, onun misilsiz bədii dühası və poeziyasının tədqiqi haqqında çoxillik gərgin yaradıcılıq axtarışlarının səmərəli nəticəsi, T.Novruzovun məqalədən-məqaləyə artan, əsərdən-əsərə böyüyən, kitabdan-kitaba inkişaf edən, monoqrafiyadan-monoqrafiyaya öz siqlət və sanbalını genişləndirən nəzəri fikir və mühakimələrinin uğurlu yekunudur. Novator mahiyyət daşıyan bu dəyərli əsərdə Sabir irsini daha ətraflı və müfəssəl elmi təhlilə cəlb olunmağa, onu öyrənməyə, ənənələrini kəmiyyət və keyfiyyətcə inkişaf etdirməyə, müasir elmi təfəkkürlə zənginləşdirməyə çağırış da açıq-aşkar sezilir.

**Məhərrəm Hüseynov,**
**Filologiya fakültəsinin dekan müavini,**
**filologiya üzrə fəlsəfə doktoru, dosent**



# Yüksək nitq mədəniyyətinə yiyələnək

Azərbaycan öz dövlət müstəqilliyini əldə etdiyi ilk dövrlərdən dilimizin inkişafına, tətbiq dairəsinin genişlənməsinə xüsusi diqqət və qayğı göstərilmiş, dövlət dili olaraq inkişaf etdirilməsi ilə bağlı ulu öndərimiz Heydər Əliyevin imzaladığı fərmanlar dilimizin öyrənilməsi, elmi tədqiqatının fəallaşdırılması və cəmiyyətdə işlənməimkanlarını daha da artırmışdır.

Dilimizin inkişaf etdirilməsi üçün geniş bir imkanın yarandığı indiki dövrdə bu dildən istifadə edən hər bir kəsin, bütövlükdə cəmiyyətin borcu onun qaydalarına, normalarına riayət etmək, təmizliyini, saflığını, gözəlliyini qorumaq, korlanmasına yol verməməkdir. Elə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında" 2012-ci il mayın 23-də imzaladığı sərəncam da dövlətçiliyimizin başlıca rəmzlərindən olan ana dilinin istifadəsinə və tədqiqinə dövlət qayğısının artırılmasını, ölkəmizdə dilçilik elmi sahəsində vəziyyətin əsaslı şəkildə yaxşılaşdırılmasını təmin etmək baxımından son dərəcə mühüm bir sənəddir. Sərəncamda oxuyuruq: "Ölkəmizin zaman-zaman müxtəlif imperiyalar tərkibində yaşamağa məcbur olmasına baxmayaraq, ana dilimiz hətta bu ağır vaxtlarda belə milli məfkurənin, milli şüurun və milli-mədəni dəyərlərin layiqincə yaşamasını və inkişafını təmin etmişdir. Bu gün onun qorunması və qayğı ilə əhatə olunması müstəqil Azərbaycanın hər bir vətəndaşının müqəddəs borcudur".

Dilimizin qorunub saxlanmasında ali məktəblərin, xüsusilə bu dili yetişən nəslə bilavasitə aşılamalı olan pedaqoji institut və universitetlərin üzərinə böyük vəzifələr düşür. Ali pedaqoji təhsili başa vuran hər bir gənc digər keyfiyyətlərlə yanaşı, öz fikrini ana dilində şifahi və yazılı şəkildə düzgün, aydın, sərbəst, səlis, təsirli, anlaşıqlı və inandırıcı bir tərzdə ifadə edə bilməyi bacarmalıdır. Onun nitqi ixtisasından asılı olmayaraq ədəbi dilin orfoepik, orfoqrafik, leksik, qrammatik, üslub normalarına uyğun olmalı, fikirlər məntiqilik baxımından biri digərini tamamlamalıdır. Müşahidələr göstərir ki, tələbələrin nitqi bu tələblər baxımından heç də tələb olunan səviyyədə deyil. Onların nitqində adi danışıq dili və yerli şivəyə xas olan tələffüz qüsurları (məsələn: alajam, gələjəm, mıyı (bunu), yanı (yəni), cərcin (gərgin), hasant, dərislik (dərslik), mubtadə, gəlmeg, sanaye, təyyin, qabul, ahalı, ləmpə, nərazı, bə:dii (ə uzun deyilir), aton vəs.) özünü göstərir. Bu qüsurların bir qismi alınma sözlərdə vurğunun düzgün işlədilməməsi(məsələn: Koso'va, liri'ka, fizi'ka, texniko'm, bu'ro, sü'jet, re'jim, Te'xas, Viktor Hü'qo, metafo'ra, ma'nevr, nəzə'riyyə, i'sim, ə'dat, bü'tün, da'ha, o'xu və.s) nəticəsində baş verir. Bu cür qüsurlu tələffüz nitqin estetik təsirini zəiflədir, gözəlliyinə xələl gətirir, bəzən də məna dolaşıqlığına, fikrin çətin mənimsənilməsinə səbəb olur.

Tələbələrin nitqində nəzərə çarpan digər qüsur lüğət ehtiyatının azlığıdır. İstər danışıqda, istərsə də yazıda sinonim, antonim, omonim, çoxmənalı sözlər, atalar sözü, zərb-məsəllər, frazeoloji ifadələr, nitqin təsir gücünü artıran digər vasitələrin lazımi səviyyədə işlədilə bilməməsi səbəbindən təkrarlara, qeyri-dəqiqliyə, lüzumsuz təfərrüata yol verilir. Oxu prosesində də çatışmazlıq özünü göstərir. Məzmuna uyğun intonasiya, məntiqi vurğu, fasilə, temp, tembr və s. kimi mənalı səslənmə vasitələrindən lazımi səviyyədə istifadə edə bilməmək monotonluq yaradır, nitqin, oxunun təsirini azaldır .

Nitq zamanı cümlə qurmaq, fikri məntiqi ardıcıllıqla, rabitəli, konkret şəraitə uyğun ifadə edə bilməkdə də çətinliklər müşahidə olunur. Nəhayət, mədəni nitq üçün xüsusi əhəmiyyət kəsb edən müraciət etmək, müsahibi dinləmək, sual vermək, söhbətə qoşulmaq, müsahibin nitqinə müdaxilə etmək, şad və bəd xəbərləri çatdıra bilmək və s.-də etik qaydalara istənilən səviyyədə əməl olunmur. Müəllimlə tələbə arasında münaqişə, narazılıq çox zaman nitqin etik qaydalarının pozulması səbəbindən baş verir.

Ali təhsil müddətində tələbədə öz nitqini dərk etmək, danışığını nəzarətdə saxlamaq, başqasının danışığı, oxusu, eləcə də yazısının müsbət və qüsurlu cəhətlərini müəyyənləşdirə bilmək kimi keyfiyyət lazımi dərəcədə formalaşmır.

Tələbənin yüksək nitq mədəniyyətinə yiyələnməsi məsələsindən söhbət gedərkən bunun daha çox Filologiya fakültəsinin tələbələri üçün lazım olduğu fikri irəli sürülür. Burada bir həqiqət var ki, filoloqlar sözün əsl mənasında söz ustası olmalı, nitq bacarıqları ilə fərqlənməli, digər fakültə tələbələrinə də nümunə olmalıdırlar. Axı onlar ədəbi dilimizin qoruyucuları, yayıcıları, yaşadanları, tənzimləyiciləridir. Müşahidələr göstərir ki, filoloq tələbələrin heç də hamısı bu keyfiyyətə tələb olunan səviyyədə yiyələnə bilmirlər. Düzdür, təhsil müddətində onlar dilçilik elmi, onun müasir problemləri, Azərbaycan dilinin ayrı-ayrı sahələri vəs. bağlı lazımi biliklər alırlar. Burada dil öyrədilir, nitqə isə bir o qədər əhəmiyyət verilmir. Nəzəri biliklərdən nitq praktikasında istifadə məsələsinə o qədər də əhəmiyyət verilmir. Orta məktəbi " lal" təlim-testlə, nə şagird, nə də müəllimin sistemli danışığı olmadan başa vuran şagird (tələbə) eyni qayda ilə ali təhsilə yiyələnir ki, bu, nitq vərdişlərinin inkişafını təmin edə bilmir. Pedaqoji və Filologiya fakültələrində nitq, ifadəli oxu bacarıqlarının yaradılmasını qarşısına məqsəd qoyan nitq mədəniyyəti, ifadəli oxu, şifahi xalq ədəbiyyatı kimi fənlərdən də imtahanlar yazılı şəkildə aparılır. Bunun nəticəsində tələbə yazılı və şifahi nitqdən sərbəst şəkildə istifadə edə bilmir, bir ərizə və ya tərcümeyi-hal yazarkən imla və üslub səhvlərinə yol verir, müxtəlif nitq şəraitində-iclasda, yığıncaqda, konfransda və digər rəsmi tədbirlərdə, radio-televiziya verilişlərinə, çıxışa, müsahibəyə cəlb olunarkən fikrini sərbəst ifadə etməkdə çətinlikçəkir, çox zaman bundan imtina edir. Başqa sözlə, tələbə nitq baxımından həyata istənilən səviyyədə hazırlanmır.

Gələcəyin müəllimi, ziyalısı olacaq tələbənin yüksək nitq mədəniyyətinə yiyələnməsi vacibdir, günün tələbidir. İxtisasından asılı olmayaraq, bütün fakültələrdə nitq mədəniyyəti bir fənn kimi tədris olunmalıdır. Bu fənnin tədrisində tələbələr mədəni nitqin bir sıra məsələləri - Azərbaycanda nitq mədəniyyətinin tarixi, düzgün nitqə verilən başlıca tələblər, nitqin normaları, formaları, növləri, yazılı nitq mədəniyyəti, əməli yazılar, nitqin etik qaydaları, etiketləri, nitqə hazırlıq və.s barədə biliklərə yiyələnməli, öz nitq təcrübələrini təkmilləşdirməlidir. Qoy tarixçi, riyaziyyatçı, fizik, bioloq, kimyaçı və s. öz ixtisasını bilməklə yanaşı, gərəkdir ki, öz ana dilində səviyyəli nitq qabiliyyətinə malik tərzdə danışmağı da bacarsın. Söz ustası, natiq olsun, nitqin etik qaydalarını gözləsin, bu keyfiyyəti gələcəkdə öz nümunəsində şagirdlərinə də aşılasın. Nitq inkişafı tələbə şəxsiyyətinin, dünyagörüşünü formalaşması təfəkkürün inkişafı ilə bağlıdır. Təfəkkür və nitq inkişafı üzrə iş vəhdətdə aparıldıqda səmərəli nəticə verə bilər.

Təfəkkür bütün fənlər üzrə inkişaf etdirilir. Demək, nitqin inkişafı ilə bütün pedaqoji kollektiv məşğul olmalıdır. Şübhəsiz, bu işdə uğur qazanmağın birinci şərti müəllimin özünün nümunəvi nitqə sahib olmasıdır. Bu keyfiyyətə yiyələnməklə müəllim dilimizi, dərs dediyi fənni tələbələrə sevdirəvəöyrədəbilər. Müdafiə şurasında opponentlər dissertasiya ilə bağlı nöqsanlarıgöstərərkən, adətən ən axırda bir sıra imla və üslubqüsurlarının da olduğunu qeyd edirlər. Əslindəbu, tədqiqat əsəri üçün ciddi qüsur sayılmalıdır. Elmlər doktoru yaxud fəlsəfə doktoru alimlik dərəcəsi adına iddiaçı olan (onların çoxu ali məktəbdə müəllim, elmi işçi, laborant işləyir) orfoqrafiya qaydalarına əməl etmirsə, işarə və üslub səhvlərinə yol verirsə, sözləri, cümlələri düzgün yaza bilmirsə, dilimizin qorunmasını, təmizliyini kimdən tələb etməliyik? Onlar elmi, savadı və digər məziyyətləri ilə birlikdə dildən istifadə bacarığına görə də digərlərinə nümunə olmalıdır.

Nitq mədəniyyəti Azərbaycan Dövlət İqtisad Universitetində, Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyasında və digər ali məktəblərdə bir fənn kimi tədris olunur. Öz uğurlarını dildən, sözün gücündən istifadə etməklə qazanmalı olan müəllimin yüksək nitq bacarığına yiyələnməsi digər ixtisas sahibərindən daha çox vacibdir.

Nitq mədəniyyəti ADPU-nun Filologiya və Pedaqoji fakültələrində seçmə fənn kimi tədris olunur. Təəssüf ki, onun saatları xeyli azaldılmışdır. Moskva Pedaqoji İnstitutunda Ritorika kafedrası fəaliyyət göstərir. Kafedranın məqsədi gələcəyin müəllimlərinə natiqlik sənətinin sirlərini öyrətmək, nitqlərini inkişaf etdirməkdir. Hələ üstəlik Rusiyanın orta məktəblərində aşağı siniflərdən başlayaraq "İctimai ünsiyyət" fənni də tədris olunur ki, mədəni nitq, onun etik qaydaları şagirdlərə öyrədilir. Bu təcrübəni bizdə də tətbiq etmək olar və lazımdır. Bunun üçün xüsusi kafedranın açılmasına ehtiyac da yoxdur. Dilçilik, Azərbaycan dili və onun tədrisi metodikası kafedralarında nitq mədəniyyəti fənnini təkcə Filologiya, yaxud Pedaqoji fakültələrdə deyil, digər fakültələrdə də yüksək səviyyədə tədris edə biləcək mütəxəssislər vardır. ADPU-da nitq mədəniyyəti ilə bağlı müəyyən ənənə, təcrübə olmuşdur. Keçən əsrin 80-ci illərində universitetdə dilimizi qoruyub saxlamaq, onun tətbiqi dairəsini genişləndirmək məqsədilə nitq mədəniyyəti mövzusunda ümumrespublika konfransları keçirilmiş, konfransa digər respublikalardan da görkəmli alimlər, dilçilər dəvət olunmuş, konfransın materialları toplu halında dərc edilərək oxuculara çatdırılmışdır. Bu tədbirlər rus dilinin üstünlüyü şəraitində həyata keçirilmişdir. Dilimizin, sözün həqiqi mənasında dövlət dili, başlıca ünsiyyət vasitəsi olduğu indiki zamanda belə tədbirləri daha geniş miqyasda reallaşdırmaq olar. Universitetimizdə ictimai-siyasi hadisələr, yubileylər, ildönümləri, bayramlar, əlamətdar günlər və s. ilə bağlı görüşlər, disputlar, konfranslar və s. keçirilir ki, bunlar lazımdır, tədqirəlayiqdir. Belə tədbirlərin biri dənitq mədəniyyəti məsələlərinə həsr edilsə, şübhə yoxdur ki, faydalı olar. Bu tədbirə respublikanın tanınan söz ustaları- yazıçılar, şairlər, aktyorlar, diktorlar, radio və televiziya verilişlərinin aparıcıları, bilavasitə bu sahə ilə məşğul olan dilçilər və digər şəxslər dəvət olunsa, tələbələr mədəni nitqin, düzgün danışa və yaza bilməyin ictimai həyatda rolunu, əhəmiyyətini şüurlu olaraq dərk edər, bu keyfiyyətə yiyələnmə yönümündə səylərini artırarlar.

Fakültələrdə ixtisaslara, fənlərə aid adların, terminlərin, anlayışların tələbələr tərəfindən düzgün tələffüzünə, eləcə də yazılmasına xüsusi diqqət yetirilməlidir. Ayrı-ayrı fənlər üzrə vurğusu, səs tərkibi düzgün tələffüz olunmayan sözlərin, terminlərin məsələn: coğrafiyadan ölkə, şəhər, çay, dəniz və s. tarix fənnindən tarixi şəxsiyyətlərin, riyaziyyatdan anlayışların, terminlərin, məşhur riyaziyyatçıların adlarının və s. yazılış və düzgün tələffüzünü göstərən lüğətlər tərtib edilib tələbəyə çatdırılsa, bu nitq qabiliyyətinin inkişafı baxımından faydalı olar.

Bütün səylərimizi birləşdirib nitq üzərində vahid nəzarəti yaratmalıyıq.Dilimizi bu yolla qoruya, inkişaf etdirə bilərik.

**Nadir Abdullayev,**
**Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının professoru**

# TÜRKİYƏLİ TƏLƏBƏLƏRİN SEVİNCİ

Son zamanlar Azərbaycanda elm və təhsilə diqqətin yüksək səviyyədə artırılması nəticəsində ölkəmizdə ali təhsil almaq istəyən əcnəbi vətəndaşların sayı artmaqdadır. Daha çox dost və qardaş dövlət olan Türkiyə Respublikasından ölkəmizə ali təhsil almaq üçün üz tutan gənclərin sayı ildən-ilə artır. Bu da Azərbaycanın təhsil sahəsinin böyük uğur və nailiyyətlərindən xəbər verir. Onu da qeyd edək ki, əvvəllər Azərbaycanda ali təhsil alan türkiyəli tələbələr təhsillərini başa vurub Vətənə döndükdən sonra diplomlarının Türkiyədə tanınması üçün Seviye Tesbit Sınavı (STS) vermək məcburiyyətində idilər. Ötən ilin oktyabr ayında ADPU-da təhsil alan bir qrup türkiyəli tələbə Seviye Tesbit Sınavının (STS) ləğvi ilə bağlı ərizə ilə yazılı surətdə müraciət etmişlər. Sevindirici haldır ki, türkiyəli tələbələrin bu müraciəti nəticəsində qardaş ölkənin Ali Təhsil Qurumunun 28.01.2013-cü ildə verdiyi rəsmi bəyanata əsasən xaricdə pedaqoji və tibb təhsili alan türkiyəli tələbələrin diplomlarının Türkiyədə etibarlılığının təsdiqi və tanınması üçün tətbiq olunan Seviye Tesbit Sınavı (STS) ləğv olunmuşdur. Buna tələbələr öz təşəbbüskarlıqları və fəallıqları nəticəsində nail olmuşlar. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) təhsil alan türkiyəli tələbələrin bu işdə göstərdikləri fəallıq xüsusi qeyd edilməlidir.

Respublikamızın tanınmış ali təhsil müəssisələrindən biri olan ADPU əcnəbi vətəndaşların, xüsusilə türkiyəli tələbələrin təhsil almaları üçün müraciət olunan universitetlər sırasındadır. Bu ali məktəbdə təhsil alan əcnəbi tələbələrə xüsusi diqqət və qayğı göstərilir, onların yüksək səviyyədə elm və biliyə yiyələnmələri üçün istənilən şərait yaradılır.

Təsadüfi deyildir ki, 2005-ci ildə ADPU-da Əcnəbi tələbələrin işi üzrə fakültə, 2008-ci ildə isə həmin fakültənin tərkibində Əcnəbi tələbələrin hazırlığı şöbəsi yaradılmışdır. Yarandığı vaxtdan bu günə kimi tələbələrin mənafeyinə xidmət edən bu qurumlar əcnəbilərin mükəmməl şəkildə təhsil almaları üçün əlindən gələni əsirgəmir. Əcnəbi tələbələrin hazırlıq kursunu məhz ADPU-da başa vurmaları bir daha bu ali təhsil ocağının rəhbərliyinin onlara olan yüksək diqqətdən xəbər verir. Əcnəbi tələbələrə burada müxtəlif sahələr üzrə yüksək səviyyəli mütəxəssislər, elm və təhsil xadimləri bilik öyrədirlər. ADPU-da təhsil alan əcnəbi tələbələrin təhsil keyfiyyətini yüksəltmək məqsədilə burada Türkiyəli Tələbələrin İdarə Heyəti yaradılmış və onun uğurlu şəkildə fəaliyyət göstərməsi üçün respublikamızda yeganə olaraq Pedaqoji Universitetdə xüsusi otaq ayrılmışdır.



ADPU-da təhsil alan türkiyəli tələbələrin sözlərinə görə, pedaqoji və tibb sahəsi üzrə təhsil alan bütün türkiyəli tələbələr üçün Seviye Tesbit Sınavının (STS) ləğv olunması müsbət bir haldır. Pedaqoji Universitetdə təhsil alan türkiyəli tələbələr bu uğura imza atdıqları üçün çox sevinirlər.

Biz də öz növbəmizdə təşəbbüs göstərərək bu uğura nail olmuş bütün türkiyəli tələbələri ürəkdən təbrik edir və onlara uğurlar arzulayırıq.

**Leyla Kərimova,**
**“Türk araşdırmaları” ETM-nin elmi işçisi,**
**Əcnəbilərin hazırlığı şöbəsinin müəllimi,**
**AJB-nın üzvü,**
**Ali Gökbey Uluç,**
**Türkiyəli Tələbələrin İdarə Heyətinin Sədri**

*Tələbələrimizin yaradıcılığı*

# Azərbaycanda gender probleminə bir baxış

Gender (cins bərabərliyi) problemi cəmiyyətin, bəlkədə insanlığın inkişafına zərbə vuran ən böyük problemlərdən biridir. “Gender problemi” dedikdə ən çox qadınların fiziki və mənəvi zorakılığa məruz qalması nəzərdə tutulur. Şərq mühitinin bir hissəsi olan Azərbaycan özündə Qərbin bir sıra cəhətlərini əks etdirsə də, bu gün respublikamızda gender problemi özünü qabarıq şəkildə göstərir. Bu problem ailədə qız uşaqlarının doğulduğu zamandan başlanır ki, bunun da nəticəsi olaraq məktəb yaşına qədər uşaq artıq bir sıra psixoloji zədə almış olur. Əlbəttə, bunu bütün ailələrə və bütün uşaqlara şamil etmək olmaz. Amma bələləri var və heç də az deyil. Bələlərinin almış olduğu psixoloji zədəni aradan qaldırmaq üçün müəllimin üzərinə böyük iş düşür. Nəzərə alsaq ki, Azərbaycan qadını öz iradəsi, mərdliyi, mənəvi saflığı və sədaqəti ilə cəmiyyətimizin həyatında, xalqımızın milli-mənəvi dəyərlər sisteminin formalaşmasında hansı müstəsna rola malikdir, Azərbaycan mühitində gender probleminin xalqımıza vurduğu zərbə qismən aydınlaşar.

Tarixdən məlumdur ki, Azərbaycan mədəniyyətinin və elminin inkişafında mühüm mərhələ olan orta əsrlər dövründə Azərbaycan qadınının fəaliyyəti xalqımızın milli-mədəni ənənələrinin qorunub saxlanılmasına və zənginləşdirilməsinə xidmət etmişdir.XII əsr poeziyasının görkəmli nümayəndələrindən olan Məhsəti Gəncəvinin poeziya məclisləri Azərbaycan qadınının adını uzaq ellərdə tanıtdığı da bizlərə bəllidir.

Bu siyahını artırmaq da olar. Orta əsr Azərbaycan hökmdarlarından Qızıl Arslanın həyat yoldaşı Qətibə xanım,Uzun Həsənin anası Sara Xatun, Şah İsmayıl Xətainin qızı Məhinbanu,Şah Abbasın anası Xeyransa bəyim, əfsanəvi Tuti Bikə və digər görkəmli qadın siyasətçilərin və dövlət xadimlərinin adları bu gün də hörmətlə yad edilir.

Yaxud, XIX əsri götürək: bu əsr Azərbaycan qadınının fəallığı və böyük yaradıcılıq uğurları ilə səciyyəvidir. Bu mənada Xurşudbanu Natəvanın, Ağa Bəyim Ağa Ağabacının, Qönçəbəyimin, Sevda Qarabağinin və başqalarının yaradıcılığı diqqəti çəkir. Azərbaycan qadınına cəmiyyətin daşıyıcı simalarından biri kimidövlət səviyyəsində diqqət yetirilməsi



XX əsrin əvvəllərinə təsadüf edir. Belə ki, 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin yaranması Azərbaycan qadınının cəmiyyətin fəal üzvünə çevrilməsi üçün geniş imkanlar yaratdı.1921-ci il Azərbaycan qadınlarının I qurultayının keçirildiyi il kimi yaddaşlardadır. Azərbaycan SSR Xalq Komissarları İcraiyyə Komitəsinin sədri Nəriman Nərimanovun qurultayda etdiyi məruzənin əsas qayəsini qadın azadlığı ideyaları təşkil edirdi.Qurultaydan sonra Azərbaycan qadınlarının maariflənməsi, ictimai fəallığının artırılması istiqamətində mühüm işlər həyata keçirildi.1921-ci ildə qızlar üçün nəzərdə tutulmuş Məktəbəqədər Tərbiyə İnstitutu bir il sonra Ali Qadın Pedaqoji İnstituta çevrildi. Ceyran Bayramovanın təşəbbüsü ilə yaradılmış ilk qadın klubu XX əsrin 20-ci illərində respublikamızda qadın hərəkatının inkişafında mühüm rol oynadı. 1932-ci ildə “Şərq qadını” jurnalının nəşrə başlaması Azərbaycan qadınlarının həyatında əlamətdar hadisə oldu.

İkinci Dünya müharibəsi qadınların əməyə daha geniş miqyasda cəlb edilməsinə səbəb oldu.Bir çox sahələrdə cəbhəyə gedən kişiləri qadınlar əvəz etdi.- Leyla Məmmədbəyova, Züleyxa Seyidməmmədova, Sona Nuriyeva, Şövkət Səlimova kimi döyüşçü Azərbaycan qadınlarının adı tarixdən hamıya məlumdur.

1988-ci ildə respublikada cərəyan edən mürəkkəb proseslərdə qadınlar da kişilərlə bərabər iştirak edirdilər.1990-ci il yanvar ayının 19-dan 20-nə keçən gecə Sovet qoşunlarının Bakıda və respublikanın digər şəhər və rayonlarında törətdikləri qanlı faciənin qurbanları arasında qadınlar da var. Azərbaycanın Milli Qəhrəmanları-Qarabağ uğrunda döyüşlərdə həlak olmuş jurnalist Salatın Əsgərova və həkim Gültəkin Əsgərova yeni dövrün fədakarlıq rəmzləridir.

Daha sonra, yəni müstəqil Azərbaycan Respublikasının 1995-ci ildə qəbul edilmiş ilk milliKonstitusiyası qadınların kişilərlə bərabər hüququnu təsbit etdi və demokratik dövlət quruculuğu prosesində qadınların fəal iştirakının hüquqi bazasını yaratdı.

1995-ci ildə Pekində keçirilən IV Ümumdünya Qadınlar Konfransına hazırlıq dövründə Azərbaycanda fəalliyyət göstərən Qadınların Milli Komitəsi Pekin Konfransına ümummilli məruzəni hazırlayıb təqdim etmişdir.Konfransdan sonra ümummilli fəaliyyət platformasına aid müzakirələr və konfranslar keçirilmişdir.1995-ci il iyunun 30-da Birləşmiş Millətlər Təşkilatının “Qadınlara münasibətdə ayrı-seçkiliyin bütün formalarının ləğv olunması haqqında” Konvensiyaya qoşulan respublikamız bu yöndə öz üzərinə müvafiq öhdəliklər götürmüşdür.

Qeyd olunanlardan başqa, Azərbaycan Respublikası Prezidentinin 14 yanvar 1998-ci il tarixli fərmanı ilə Qadın Problemləri üzrə Dövlət Komitəsi, 2006-cı ildə isə bu komitənin bazası əsasında Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsi yaradılmış Nazirlər Kabinetinə ölkənin siyasi, iqtisadi, mədəni həyatında qadınların rolunu artırmaq məqsədilə müvafiq təkliflər paketi işləyib hazırlamaq tapşırılmışdır.Təbii ki,qadın əməyinə verilən bu dəyər müqabilində ölkəyə savadı, təfəkkürü,elmi potensialı ilə iştirak etməyə qabil qadınlar yetişdirilməsikimi bir mühüm vəzifədəAzərbaycan təhsilinin öhdəsinə böyük iş düşür.

* * *

...Unudulmamalıdır ki, gender bərabərliyi bir mədəniyyətdir. Bu mədəniyyət insana kiçik yaşlarından aşılanmalıdır. Uşaqlarla məşğul olan tərbiyəçilər, pedaqoqlar onlara gender bərabərliyini izah etməlidirlər. İlk növbədə, təbii ki, onların başa düşəcəyi tərzdə: kiçikyaşlı uşaqları müxtəlif oyunlaracəlb etməklə, sonrakı yaş dövlərində isə təlimlər və seminarlar yolu ilə.

**Səbinə Səmədova,**
**II kurs magistrantı**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyəti “Nurlan” nəşriyyatının direktoru, professor Nadir Məmmədliyə qardaşı

**NATİQ MƏMMƏDOVUN**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Kimya fakültəsinin dekanı, dosent Vaqif Həsənova əmisi

**ATABƏY ƏHMƏDOVUN**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fizikanın tədrisi metodikası kafedrasının böyük laborantı

**ELNARƏ ŞAHBƏNDƏYEVANIN**

vaxtsız və faciəli vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə, yaxınlarına dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV
ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41
Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır
Mətbuat və informasiya şöbəsinin web-portalı www.press.adpu.az Şəhadətnamə № 191
Sifariş: 840 Sayı: 1500 Çapa imzalanıb: 31.01.2013-cü il
ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, “Azərbaycan” nəşriyyatında səhifələnib və “Azərbaycan” nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.